QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Yanvar 2016
01 (1074)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## 2016-cı ilin Azərbaycan Respublikasında "Multikulturalizm ili" elan edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Tarixi İpək yolunda yerləşən Azərbaycan müxtəlif sivilizasiyaların qovuşduğu məkan olaraq, əsrlər boyu milli-mədəni rəngarənglik mühitinin formalaşdığı, ayrı-ayrı millətlərin və konfessiyaların nümayəndələrinin sülh, əmin-amanlıq, qarşılıqlı anlaşma və dialoq şəraitində yaşadığı diyar kimi tanınmışdır. Ölkəmizdə multikulturalizm artıq alternativi olmayan həyat tərzinə çevrilmişdir. Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin yaradılması müasir dövrdə respublikamızda gerçəkləşdirilən siyasətin tolerantlıq prinsiplərinə bu gün də sadiq qalmasının bariz nümunəsidir.

Birləşmiş Millətlər Təşkilatının Sivilizasiyalar Alyansının 7-ci Qlobal Forumunun 2016-cı ildə Bakı şəhərində keçirilməsi barədə qərar qəbul edilməsi dünya ölkələrinin Azərbaycandakı multikultural mühitə olan münasibətinin real ifadəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycanda multikulturalizm ənənələrinin qorunub saxlanması, daha da inkişaf etdirilməsi və geniş təbliğ olunması məqsədi ilə **qərara alıram:**

1. 2016-cı il Azərbaycan Respublikasında "Multikulturalizm ili" elan edilsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi, Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi, Azərbaycan Respublikasının Təhsil Nazirliyi, Azərbaycan Respublikasının Dini Qurumlarla İş üzrə Dövlət Komitəsi və Azərbaycan Milli Elmlər Akademiyasının təkliflərini nəzərə alaraq, 2016-cı ilin Azərbaycan Respublikasında "Multikulturalizm ili" elan edilməsinə dair tədbirlər planını bir ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 11 yanvar 2016-cı il*

## 20 Yanvar-xalqımızın azadlıq mübarizəsinin faciə və qəhrəmanlıq səhifəsi

### *ADPU-da 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümü ilə əlaqədar anım mərasimi keçirilib*

Yanvar ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümü ilə əlaqədar anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimini giriş sözü ilə açaraq bildirib ki, bu günlər ölkəmizdə və dünyanın bir çox ölkələrində milli faciəmiz olan 20 Yanvar faciəsi ilə bağlı silsilə tədbirlər keçirilir. Bizim bu gün keçirdiyimiz anım mərasimi də həmin silsilə tədbirlər çərçivəsində keçirilən bir toplantıdır.




Rektor Y.Məmmədov çıxışı zamanı deyib ki, xalqımızın 1988-ci ildə Dağlıq Qarabağ münaqişəsi ilə əlaqədar başlayan milli-azadlıq hərəkatı öz möhtəşəmliyi və prinsipiallığı ilə fərqlənirdi. Ölkəmizdə milli-azadlıq mücadiləsi Azərbaycanın ayrılmaz tərkib hissəsi olan Dağlıq Qarabağda baş qaldıran erməni separatizminə və qədim Türk torpaqları sayılan Qərbi Azərbaycandan 250 mindən çox soydaşımızın zorla öz ata-baba yurdlarından qovulmasına etiraz əlaməti olaraq keçirilən nümayiş və mitinqlərlə başladı. Xalqımız həmin nümayiş və mitinqlərdə keçmiş Sovetlər Birliyinin rəhbərliyindən və onun respublikamızdakı təmsilçilərindən ermənilərin qanunsuz hərəkətlərinə son qoyulmasını, münaqişənin ideoloqlarının, təşkilatçılarının və icraçılarının cəzalandırılmasını tələb edirdi.

Həmin dövrdə respublikamızda ictimai-siyasi vəziyyəti ağırlaşdıran amillər sırasında ölkə rəhbərliyində təmsil olunan şəxslərin səriştəsizliyi, milli maraqlardan çox uzaqda dayanmaları, həmçinin böyük iddialarla yaşayan siyasi partiya təmsilçilərinin hadisələrin sonrakı gedişini düzgün proqnozlaşdıra bilməmələri də mühüm yer tuturdu.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, 1990-cı il yanvarın əvvəllərində keçmiş SSRİ-nin xüsusi xidmət orqanlarının əməkdaşları yerlərdəki emissarlarının yaxından köməkliyi ilə Bakıda müxtəlif iğtişaşlar törədilər. Bu isə öz növbəsində M.Qorbaçov hakimiyyətinə Bakıya qoşun yeritmək üçün əsas verdi. 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə keçmiş Sovet Ordusunun ən müasir döyüş texnikası ilə silahlanmış hissələri Bakıda çox dəhşətli və qanlı bir cinayət törətdilər. Öz hüquqlarının bərpası üçün küçə və meydanlara toplaşmış dinc mülki əhaliyə odlu silahlardan atəş açıldı, xalq güllələnən edildi. Xüsusi təlim keçmiş əsgərlər, hətta qoca və uşaqlara belə rəhm etmirdilər. Nəticədə, həmin gecə 131 nəfər (bəzi mənbələrdə bu rəqəm 170 nəfər göstərilir) soydaşımız amansızcasına qətlə yetirildi, 700-dən çox adam yaralandı, 321 nəfər itkin düşdü, yüzlərlə insan həbs edildi. Qeyd etmək istəyirəm ki, ADPU milli müstəqilliyimiz və ərazi bütövlüyümüz uğrunda gedən mübarizədə 16 nəfər şəhid verib. Onlardan 2-si xüsusi şücaət və qəhrəmanlıqlarına görə ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adına (M.İbrahimov və M.Quliyev), 2-si isə «Azərbaycan Bayrağı» ordeninə (M.Məmmədov və M.Bayramov) layiq görülüb.

Sovet Ordusunun xüsusi təlim keçmiş hissələrinin Azərbaycanda törətdiyi cinayətlər yalnız Bakıda baş vermiş faciə ilə kifayətlənmirdi. Yanvarın 25-də və 26-da Neftçala və Lənkəranda bir sıra cəza tədbirləri həyata keçirildi və insanlar amansızlıqla qətlə yetirildilər. Digər tərəfdən, Azərbaycan informasiya blokadasına salınmışdı. Dəhşətli faciədən bir az öncə Azərbaycan Televiziyasının bloklarından biri partladılmışdı. Radio işləmirdi, qəzetlər nəşr edilmirdi. Məlumatsızlıq xalqı çaşbaş vəziyyətə salmışdı, insanlar nə edəcəklərini bilmirdilər. Eləcə də dünya ictimaiyyəti Azərbaycanda baş vermiş bu qanlı və məşum hadisədən xəbərsiz idi.

Belə ağır və müsibətli bir vaxtda xalqımızın vətənpərvər oğlu, ulu öndərimiz Heydər Əliyev müalicə olunduğu Barvixa xəstəxanasından çıxaraq təzyiq və təqiblərə məruz qalmasına baxmayaraq, yanvarın 21-də oğlu və silahdaşı cənab İlham Əliyevlə birgə Azərbaycanın Moskvadakı nümayəndəliyinə gələrək Sovet Ordusunun Bakıda törətdiyi bu qanlı cinayəti kəskin pisləyən bəyanat verdi və faciənin bütün günahkarlarının cəzalandırılmasını tələb etdi. Elə həmin gün ulu öndər Heydər Əliyev baş vermiş faciə ilə əlaqədar Azərbaycan KP MK, respublikanın Ali Soveti və Nazirlər Sovetinə teleqram göndərmişdir.

Rektor Y.Məmmədov çıxışında da 20 Yanvar faciəsinə verilən hüquqi-siyasi qiymətə xüsusi toxunub. Rektor Y.Məmmədov deyib: "Ulu öndərimiz Heydər Əliyev hələ Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri olarkən Azərbaycanın o vaxtkı riyakar və ikiüzlü rəhbərliyindən fərqli olaraq, 20 Yanvar hadisəsinə hüquqi-siyasi qiymətin verilməsi üçün böyük qətiyyət və prinsipiallıq nümayiş etdirmişdir. Belə ki, hələ 1990-cı il noyabr ayının 21-də böyük siyasi xadim Heydər Əliyevin rəhbərliyi ilə Naxçıvan Ali Məclisi 20 Yanvarın Milli Matəm günü kimi qeyd olunması haqqında qərar qəbul etdi. Bu əslində, həmin hadisəyə verilən ilk hüquqi-siyasi qiymət idi. Qərarda faciədə məsuliyyət daşıyan şəxslər adbaad göstərilir və onların birbaşa məsuliyyət daşıdıqları qeyd olunurdu. 20 Yanvar faciəsinin hərtərəfli, əhatəli və dolğun qiyməti xalqımızın dahi oğlu Heydər Əliyevin müstəqil Azərbaycana rəhbərlik etdiyi dövrdə verildi. 1994-cü il yanvarın 5-də Ümummilli Liderimiz müvafiq sərəncam imzaladı ki, həmin sərəncamda da faciənin respublika miqyasında geniş araşdırılıb hüquqi-siyasi qiymət verilməsi tövsiyə olunurdu. 1994-cü il yanvarın 12-də isə ulu öndərimiz Heydər Əliyevin sədrliyi ilə 20 Yanvar faciəsinin beşinci ildönümü ilə bağlı tədbirlərin hazırlanması və keçirilməsi üzrə Dövlət Komissiyasının iclası keçirildi. Həmin tarixi iclasda çıxış edən müdrik rəhbərimiz Heydər Əliyev faciəyə tam və hərtərəfli hüquqi-siyasi qiymət verilməsinin vacibliyini xüsusi qeyd etdi. Bir sözlə, yalnız ulu öndərimiz Heydər Əliyevin respublikamızda xalqın təkidli tələbi ilə yenidən dövlət rəhbərliyinə qayıtmasından sonra 20 Yanvar faciəsinə obyektiv hüquqi-siyasi qiymət verilmişdir. Məhz Ümummilli Liderimizin müvafiq sərəncamı ilə 20 Yanvar ölkəmizdə Ümumxalq Hüzn Günü elan edilmişdir. Həmin gün Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın xatirəsi dövlət səviyyəsində böyük ehtiramla yad olunur.

Rektor Y.Məmmədov qeyd edib ki, ulu öndərimiz Heydər Əliyev tərəfindən əsası qoyulmuş müdrik siyasi kursu çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev 20 Yanvar şəhidlərinin və bütövlükdə bu qəbildən olan şəxslərin ailələrinə dövlət səviyyəsində qayğı və köməkliyin göstərilməsi və onların sosial müdafiəsinin gücləndirilməsi üçün bütün lazımi tədbirləri həyata keçirir. Öz milli dövlətçiliyini yenidən bərpa etmiş respublikamızda ölkəmizin suverenliyi və ərazi bütövlüyü uğrunda şəhid olmuş qəhrəman Azərbaycan övladlarının xatirələrinin əbədiləşdirilməsi üçün dövlət səviyyəsində mühüm işlər görülmüş, bütün bölgələrimizdə şəhidlərin xatirəsinə abidə-komplekslər ucaldılmışdır. Bütün bunlar xalqımızın

(Davamı 2-ci səhifədə)

# 20 Yanvar-xalqımızın azadlıq mübarizəsinin faciə və qəhrəmanlıq səhifəsi

(Əvvəli 1-ci səhifədə)






və dövlətimizin 20 Yanvar faciəsi zamanı həlak olmuş şəhid soydaşlarımızın ruhuna bəslədiyi böyük hörmət və ehtiramın parlaq nümunəsidir. Azərbaycan Prezidenti İlham Əliyev 20 Yanvar hadisələri zamanı şəhid olmuş şəxslərin ailələrinin və eyni zamanda həmin hadisələr zamanı öz sağlamlıqlarını itirərək əlil olmuş şəxslərin sosial müdafiəsinin gücləndirilməsi və onlara dövlət qayğısının artırılması məqsədilə mütəmadi olaraq müvafiq sərəncam və fərmanlar imzalayır. Həmçinin Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YAP-ın Sədr müavini Mehriban Əliyeva və Heydər Əliyev Fondunun vitse-prezidenti, İDEA İctimai Birliyinin təsisçisi və rəhbəri Leyla xanım Əliyeva Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi barədə həqiqətlərin bütün dünya ictimaiyyətinə lazımınca çatdırılması üçün böyük əzmlə, fədakarlıqla çalışırlar.




Rektor Y.Məmmədov çıxışının sonunda bildirib ki, XX əsr xalqımızın tarixinə həm qanlı fəlakət və faciələrlə, eyni zamanda həm də qəhrəmanlıqlarla dolu olan bir dövr kimi daxil olmuşdur. Biz 20 Yanvar hadisələrini həm faciə, həm də qəhrəmanlıq kimi səciyyələndiririk.

Anım mərasimində 20 Yanvar faciəsini əks etdirən sənədli film nümayiş olunub, ADPU-nun dosenti, tanınmış şair, Əməkdar müəllim Oqtay Rza faciəyə həsr etdiyi şeirini oxuyub, həmçinin Filologiya fakültəsi tələbələrinin hazırladıqları bədii kompozisiya təqdim edilib.

**Mənsur İbrahimli,**
**Gülnar Süleymanova**

## Təhsil Nazirliyində struktur dəyişikliyi aparılıb

Təhsil naziri Mikayıl Cabbarovun müvafiq əmrinə əsasən, İqtisadiyyat şöbəsinin bazasında Maliyyə və Audit şöbələri yaradılıb. Eləcə də İlk peşə və orta ixtisas şöbəsi ləğv edilərək, İlk peşə-ixtisas təhsili sektoru yaradılıb. İnsan resursları şöbəsinin Əlavə təhsil sektorunun adı dəyişdirilərək, Dövlət qulluğu məsələləri sektoru, Məktəbəqədər və ümumi təhsil şöbəsi isə Ümumi təhsil və məktəbəqədər təhsil şöbəsi adlandırılıb.

Elm və ali təhsil şöbəsinin adı dəyişdirilərək, Elm, ali və orta ixtisas təhsil şöbəsi olub. Şöbənin Tələbələrə dəstək və mübadilə proqramları və Ali təhsil sektorlarının bazasında Ali, orta ixtisas və əlavə təhsil sektoru yaradılıb.

Hüquqi ekspertiza və lisenziyalaşdırma şöbəsinin adı dəyişdirilərək, Hüquq şöbəsi, həmin şöbənin Lisenziyalaşdırma və akkreditasiya sektoru Normativ-hüquqi təminat sektoru adlandırılıb.

Qeyri-hökumət təşkilatları və kütləvi informasiya vasitələri ilə iş sektorunun adı dəyişdirilərək, İctimaiyyətlə əlaqələr sektoru adlandırılıb.

Həmçinin Protokol sektoru Beynəlxalq əməkdaşlıq şöbəsinin tərkibinə verilib.

# Vətəndaş müraciətləri üzrə yeni portal

Təhsil Nazirliyinə və tabe qurumlara müraciət edən vətəndaşların vəzifəli şəxslər tərəfindən qəbulunun asanlaşdırılması, qəbula yazılma prosesinin təkmilləşdirilməsi, müraciətlərə baxılmanın sürətləndirilməsi və keyfiyyətinin yüksəldilməsi, eyni zamanda məlumatların ümumiləşdirilməsi üçün vahid qəbul portalı yaradılıb.

Bu portal vasitəsilə Təhsil Nazirliyində və tabeçiliyində olan qurumlarda vətəndaşların qəbula yazılması, yönləndirilməsi, prosesin müşahidəsi, SMS göndəriş sistemi vasitəsilə onların məlumatlandırılması və vətəndaş məmnunluğunun öyrənilməsi mümkündür.



Portaldan səmərəli istifadəni təmin etmək üçün Təhsil Nazirliyində tabe qurumların aidiyyəti əməkdaşlarına təlimlər keçirilib. Təlimlərdə şəhər (rayon) təhsil idarələrinin (şöbələrinin), eyni zamanda ali, ilk peşə və orta ixtisas təhsili müəssisələrinin vətəndaş müraciətlərinə baxılması üzrə məsul şəxsləri iştirak ediblər. Bir həftə davam edən təlimlərdən sonra portal tam fəaliyyətə başlayıb.

# Təhsil Nazirliyi Gürcüstandakı azərbaycanlılara 12 adda dərslik və metodik vəsait göndərib

Azərbaycan Respublikasının Təhsil Nazirliyi Gürcüstanda yaşayan soydaşlarımızın Azərbaycan dilində dərsliklərlə təmin olunması istiqamətində tədbirlərini davam etdirir. Nazirlik Gürcüstana 2015-2016-cı tədris ili üçün IV, V, VI və VIII siniflər üçün 12 adda 9810 nüsxə kitab göndərib. Azərbaycan dili və ədəbiyyatı dərslikləri, müəllimlər üçün metodik vəsaitlər dekabrın 12-də Azərbaycanın Gürcüstandakı səfirliyinin vasitəçiliyi ilə bu ölkənin Elm və Təhsil Nazirliyinə təqdim olunub.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin Tədris resursları şöbəsinin baş məsləhətçisi Hüseyn Quliyev jurnalistlərə bildirib ki, Gürcüstandakı soydaşlarımızın Azərbaycan dilində dərsliklərlə təmin olunmasının əsası 1994-cü ildə ulu öndər Heydər Əliyev tərəfindən qoyulub. Bu gün Ümummilli Liderin siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev də bu




işə xüsusi diqqət göstərir. Dövlətimizin başçısının tapşırığına əsasən Təhsil Nazirliyi Gürcüstanda yaşayan azərbaycanlıların təhsil problemlərini diqqətlə öyrənib və onların dərsliklərlə təminatı istiqamətində mühüm addımlar atır. 1994-cü ildən bugünədək Gürcüstandakı soydaşlarımıza I-XI sinif şagirdləri üçün 550 minədək müxtəlif adda dərs vəsaiti göndərilib. 2013-2014-cü tədris ilində 24 adda 18 min ədəd, 2014-2015-ci tədris ilində 18 adda 19 mindən çox, 2015-2016-cı tədris ili üçün isə 12 adda 10 minədək kitab və müəllimlər üçün metodik vəsait göndərilib. Bu kitablar Gürcüstanda yaşayan azərbaycanlı şagirdlərin mükəmməl təhsil almalarında mühüm rol oynayacaq.

Gürcüstanın Elm və Təhsil Nazirliyinin metodika və koordinasiya departamentinin məsul əməkdaşı xanım Teada Paliya deyib ki, Azərbaycanın və Gürcüstanın təhsil nazirlikləri arasında imzalanmış əməkdaşlığa dair protokola əsasən Azərbaycan tərəfi bizim ölkənin vətəndaşları olan azərbaycanlılar üçün müxtəlif dərslik və metodik vəsaitlər göndərir. Bu vəsaitlər bizim tərəfimizdən müvafiq qaydada Gürcüstanda fəaliyyət göstərən Azərbaycandilli məktəblərə paylanacaq. Həmin sənədə əsasən Gürcüstan tərəfi də Azərbaycandakı gürcüdilli məktəbləri dərsliklərlə təmin edir.

Kitabların təqdimat mərasimində Azərbaycanın Gürcüstandakı səfirliyinin humanitar və mədəniyyət məsələləri üzrə attaşesi Samirə Ağayeva, Təhsil Nazirliyinin Beynəlxalq əməkdaşlıq şöbəsinin əməkdaşı Fərid Quluzadə və digər rəsmi şəxslər iştirak ediblər.

**AZƏRTAC**

# ADPU-nun Quba filialında 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümü ilə əlaqədar silsilə tədbirlər keçirilib

İlk olaraq 20 Yanvar faciəsi ilə əlaqədar Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının tədbirlər planı təsdiq edilib. Tədbirlər planına əsasən yanvar ayının 12-də ADPU-nun Quba filialının "Heydər Əliyev Mərkəzi"ndə "Qanlı Yanvar-milli taleyimizdə dönüş nöqtəsi" mövzuzunda konfrans keçirilib. Konfransda ADPU-nun Quba filialının direktoru, professor Əli Allahverdiyev, tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, filialın müəllim və tələbələri, həmçinin Quba rayonunun "Şəfəq" qəzetinin əməkdaşı, "Yurd" GİB-nin sədri Ramin Mahmudov iştirak ediblər.



Yanvar ayının 18-də ADPU-nun Quba filialının Tələbə Gənclər Təşkilatının (TGT) sədri İlkin Xanlarzadənin təşkilatçılığı ilə tələbə-gənclərin milli tariximizə, Azərbaycanın ağrılı və şərəfli günlərinə xüsusi diqqətini nəzərə alaraq rejissor Vahid Mustafayevin "Xoca" filmi nümayiş olunub. Yanvar ayının 19-da ADPU-nun Quba filialının nümayəndələri Heydər Əliyev Mərkəzində rejissor V. Mustafayevin "Qanlı Yanvar " filmini izləyiblər.

Bunlarla yanaşı, yanvar ayının 19-da keçirilən bütün imtahanlarda Azərbaycanın suverenliyi və ərazi bütövlüyü uğrunda canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, filialın "Oxucu" divar qəzetində 20 Yanvar faciəsinə həsr edilmiş məqalə və yazılar dərc olunub. Yanvar ayının 20-də isə ADPU-nun Quba filialının kollektivi rayonun Şəhidlər Xiyabanında təşkil edilmiş ümumrayon yürüşündə iştirak edib, şəhidlərin məzarları önünə əklil və qərənfilllər qoyub, habelə "Şəhidlər Muzeyi"ni ziyarət ediblər.



**Mətbuat və informasiya şöbəsi**

# ADPU-nun Qazax filialında 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümünə həsr edilmiş anım mərasimi keçirilib

19 yanvar 2016-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialının "Heydər Əliyev auditoriyası"nda 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümünə həsr edilmiş anım



mərasimi keçirilib. Anım mərasimində əvvəlcə şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad olunub və 20 Yanvar faciəsi ilə bağlı videoslayd təqdim edilib.

ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova tədbiri giriş sözü ilə açaraq 20 Yanvar hadisələrinin Azərbaycan xalqının XX əsr tarixində oynadığı rolundan danışıb, həmin hadisələrlə bağlı maraqlı faktlar söyləyib. Direktor müavini, dosent M. Yusifov isə 20 Yanvar hadisələrinin canlı şahidi kimi Sovet Ordusunun insanı dəhşətə gətirən vəhşiliklərini əks etdirən məqamlardan danışıb. Tarixçi M. Süleymanov 20 Yanvar hadisələrinin başvermə səbəbləri və bu hadisələrdən çıxarılan nəticələri tədbir iştirakçılarının diqqətinə çatdırıb.

Anım mərasimində "İbtidai sinif müəllimliyi" ixtisasının II kurs tələbəsi Səkinə Əliyeva "20 Yanvar 1990-cı il qan yaddaşımızdır", "Tarix və coğrafiya müəllimliyi" ixtisasının III kurs tələbəsi Bəsərək Vəliyeva "Azərbaycan şəhidləri heç vaxt unutmayacaq", "Məktəbəqədər təlim və tərbiyə" ixtisasının III kurs tələbəsi Nərmin Qocayeva "20 Yanvar tariximizin qürur və şərəf səhifəsidir" mövzularında maraqlı və yaddaqalan çıxışlar ediblər.



**Mətbuat və informasiya şöbəsi**

# ADPU-nun Şamaxı filialında 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümünə həsr edilmiş tədbir keçirilib

19 yanvar 2016-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında 20 Yanvar faciəsinin iyirmi altıncı ildönümünə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ilk olaraq şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad olunub və 20 Yanvar faciəsinə həsr olunmuş film nümayiş etdirilib.



ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova tədbiri giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan dövləti 20 Yanvar şəhidlərinin xatirəsini daim əziz tutur. Hər il 20 Yanvar respublikamızda Ümumxalq Hüzn Günü kimi qeyd olunur. Xalqımız igid övladlarının fədakarlığını anır, onların əziz xatirəsini ehtiramla yad edir. Ümummilli lider Heydər Əliyev 17 yanvar 2000-ci ildə 20 Yanvar təcavüzü zamanı yüksək vətəndaşlıq nümunəsi göstərərək həlak olmuş Azərbaycan Respublikası vətəndaşlarına «20 Yanvar şəhidi fəxri adı verilməsi haqqında» Fərman imzalayıb. 20 Yanvar hadisələrinin günahsız qurbanlarına, onların ailə üzvlərinə bu gün dövlət tərəfindən xüsusi qayğı və diqqət göstərilir.

Tədbirdə Humanitar və xüsusi fənlər kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Zərifə Cavadova "Tarixin qan yaddaşı", Dil, ədəbiyyat və onların tədrisi metodikası kafedrasının müəllimi Sevinc Baxşıyeva "Qara Yanvar", Tələbə Gənclər Təşkilatının sədri (TGT) Südabə Əlibəyli "Qanlı Yanvar faciəsi" mövzularında çıxışlar ediblər.

Tədbirin sonunda tələbə-gənclər hazırladıqları şeir kompozisiyasını təqdim ediblər.

**Mətbuat və informasiya şöbəsi**

# İNİLDƏDİ

"Zəlimxan ölübdü!"-dedilər bu gün...
Oğul fəryad etdi, qız inildədi.
Xəbər efirlərə hakim kəsildi,
Söhbət sızıldadı, söz inildədi.

Matəm libasını geyindi ellər,
Ağılar söylədi nəğməkar dillər,
"Yanıq Kərəmi"yə kökləndi tellər,
Kaman nalə çəkdi, saz inildədi.

Dost qəddi əyildi, qardaş:-Of!-dedi.
Eşidən hay saldı, yoldaş:-Of!-dedi.
Qaralar bağladı, sirdaş:-Of!-dedi,
Göz yaşı yandırdı, üz inildədi.

Sevgiylə anıldı öz obasında,
Qəlbləri yandıran saz havasında,
Kəpənəkçi adlı yurd-yuvasında,
Dağ sükuta daldı, düz inildədi.

Mirvari, xalqımız uf çəkdi, bu gün,
Fəxri Xiyabanda səf çəkdi bu gün,
Oxucular yaman of çəkdi bu gün,
Qış tufan qopardı, yaz inildədi.

**Mirvari Verdiyeva,**
**Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekan müavini, baş müəllim, fəlsəfə doktoru**

# Şəffaflıq və obyektivlik əsas meyardır

***İlk olaraq onu qeyd edək ki, Təhsil naziri cənab Mikayıl Cabbarov 2015-ci il dekabr ayının 15-də "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" müvafiq əmr imzalayıb. Təhsil nazirinin həmin əmrində 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, ali təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, həmçinin imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması və digər vəzifələr öz əksini tapıb.***



Məlumat üçün onu da bildirək ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov universitetdə payız semestrinin imtahan sessiyasının obyektiv, şəffaf və mütəşəkkil keçirilməsini, imtahanların gedişində yarana biləcək mənfi halların qarşısının alınmasını, yol verilən nöqsanların vaxtında aradan qaldırılmasını, həmçinin imtahanların gedişi ilə bağlı daxil olan ərizə, şikayət və təkliflərin çevik araşdırılmasını və vətəndaşların müraciətlərinə vaxtında baxılmasını təmin etmək məqsədilə İmtahan qərargahının yaradılması barədə müvafiq əmr imzalayıb. Rektor Y.Məmmədovun həmin əmrinə əsasən universitetdə tərkibinə tanınmış və təcrübəli pedaqoq-alimlərin daxil olduğu 11 nəfərdən ibarət İmtahan qərargahı yaradılıb. İmtahan qərargahının sədri Mexanika və molekulyar fizika kafedrasının müdiri, professor Edil Eyvazov, müavini Funksiyalar nəzəriyyəsi kafedrasının müdiri, professor Rəhim Rzayev, katibi isə Tədris-metodika şöbəsinin inspektoru Mafilə Talıbovadır. İmtahan qərargahının üzvləri isə ADPU-nun Musiqi və təsviri incəsənət fakültəsinin dekanı, dosent Laçın Həsənova, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov, İngilis dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Nailə Sadıqova, Üzvi kimya və kimya texnologiyası kafedrasının müdiri, dosent Rəfiqə Məmmədova, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Əcnəbi tələbələrlə iş üzrə şöbənin müdiri, dosent Nurəddin Uluxanlı, İnsan və heyvan fiziologiyası kafedrasının dosenti Elnarə Mehbalıyevadır. İmtahan qərargahının normal fəaliyyət göstərməsi üçün ADPU-nun əsas tədris binasında müvafiq otaq ayrılıb, orada lazımi şərait yaradılıb və növbətçilik cədvəli tərtib edilib. İmtahan qərargahının əlaqə telefonları (012) 408-30-29 və (012) 498-17-94-dür. İmtahan qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. ADPU-da kollokviumlar dekabr ayının 1-dən 11-dək keçirilib, imtahanların isə dekabrın 29-dan fevralın 1-dək keçirilməsi nəzərdə tutulub.



ADPU-nun "İKT, monitorinq və qiymətləndirmə Mərkəzi" nin direktoru, dosent İlham Əhmədov və elektron-test üsulu ilə keçirilən imtahanlara nəzarət qrupunun rəhbəri, dosent Yaşar Hüseynəliyev bildirdilər ki, test sualları vaxtında hazırlanaraq "İnformasiya-kommunikasiya texnologiyaları, monitorinq və qiymətləndirmə Mərkəzi"nə təqdim edilib və universitetin İnternet saytına yerləşdirilib. İmtahan cədvəlləri həmin Mərkəz tərəfindən tərtib olunaraq təsdiq edilib. Yazılı imtahanların yoxlanılması üçün də xüsusi otaq ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnir, yoxlanılır və həmin gün qiymətlər tələbələrə elan olunur. Günün sonunda isə bütün imtahanlarının nəticələri ADPU-nun İnternet saytına yerləşdirilir.

Universitetdə 5 kompüter imtahan zalı fəaliyyət göstərir. Həmin zallarda yerləşdirilmiş 200 kompüter vasitəsilə bir gündə təxminən 2000-dək tələbə imtahan verə bilir. Tələbələr test imtahanlarının nəticələrini cavabları təsdiq etdikdən dərhal sonra kompüterin ekranında görürlər.

İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr fakültələr və universitet üzrə yaradılmış münaqişə komissiyalarına, həmçinin imtahan qərargahına müraciət edirlər. İmtahan qərargahının üzvləri mütəmadi şəkildə imtahan zallarında olur, onlara ünvanlanan müraciət və təkliflərlə bağlı müvafiq qeydlər aparırlar. Eyni zamanda universitetdə valideynlərlə əlaqələrin yaradılmasına da xüsusi diqqət yetirilir ki, bu da valideynlərdə imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir. İmtahan qərargahının üzvləri tərəfindən hər hansı bir müraciətin araşdırılması və qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər imtahan qərargahının səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və qarşı tərəfin iştirakı ilə məsələyə baxılır.

İmtahanlara nəzarəti gücləndirmək üçün xüsusi kameralar quraşdırılıb. İmtahan zalında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. Eyni zamanda imtahanların keçirilməsinə nəzarəti təmin etmək məqsədilə imtahan rəhbərləri və nəzarətçi-müəllimlər təyin edilib. İmtahan rəhbərləri və nəzarətçi-müəllimlər də qeyri-ixtisas sahibləridir. Bütün imtahan rəhbərləri və nəzarətçi-müəllimlər öz öhdələrinə düşən vəzifələri məsuliyyətlə və layiqincə yerinə yetirirlər. Kompüter Mərkəzində imtahanların gedişi ilə maraqlandıqda tələbə-gənclər bütövlükdə payız semestrinin imtahan sessiyasının obyektiv və şəffaf keçirilməsindən razılıqlarını ifadə etdilər və ADPU-da onlar üçün yaradılan şəffaf və effektiv təhsil mühitinə görə universitetin rektoru, professor Y.Məmmədova öz təşəkkürlərini bildirdilər.

Biz eyni zamanda magistrantların imtahanlarının gedişi ilə də maraqlandıq. Məlumat üçün qeyd edək ki, magistrantlar imtahan verdikləri fənlərdən sualları yazılı cavablandırdıqdan və imtahan üçün müəyyən edilmiş vaxt başa çatdıqdan sonra yazı işləri götürülüb kodlaşdırılır, ixtisas müəllimləri tərəfindən elə həmin gün yoxlanılıb dekanlığa məlumat verilir. Magistrantlar da öz növbələrində ADPU-da imtahan sessiyasının obyektiv keçirilməsindən razı qaldıqlarını bildirdilər. Həmçinin SABAH qruplarında təhsil alan tələbə-gənclər də imtahan sessiyasının şəffaf və ədalətli keçirilməsindən razı olduqlarını ifadə etdilər. Biz isə tələbə-gənclərlə apardığımız söhbətdən və müşahidələrimizdən bir daha belə qənaətə gəldik ki, ADPU-da həyata keçirilən bütün bu tədbirlər imtahanların obyektiv və şəffaf keçirilməsinin təmin edilməsinə yönəlib. Bir sözlə, ADPU-da bilik yeganə meyardır.



Qeyd etdiklərimizlə yanaşı, universitet daxilində, eləcə də tədris auditoriyalarında və imtahan zallarında yaradılmış nizam-intizam, səliqə-sahman da imtahan sessiyasının obyektiv keçirilməsinə xidmət edir. ADPU-nun mühafizə xidmətinin baş mühafizəçisi Şamil Cəfərzadə, mühafizəçilər Əfqan Rəhimov, Rəşad Kərimov, Ramin Aslanov, Kənan Mansurov, Məhəmməd Bayramlı da universitetdə ictimai asayişin təmin edilməsi və daxili nizam-intizam qaydalarının lazımi səviyyədə qorunması üçün əzmlə fəaliyyət göstərirlər.

**Mənsur QÜDRƏTOĞLU,**
**Könül NƏRİMANQIZI**

# ADPU-nun Şəki filialında payız semestrinin imtahan sessiyası uğurla başa çatdı

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında ali təhsilin bakalavriat pilləsində 8 ixtisas: Azərbaycan dili və ədəbiyyat müəlimliyi, Tarix və coğrafiya müəllimliyi, Riyaziyyat və informatika müəllimliyi, İbtidai sinif müəllimliyi, Xarici dil müəllimliyi - ingilis dili, Xarici dil müəllimliyi - fransız dili, Təhsildə sosial-psixoloji xidmət, Məktəbəqədər təlim və tərbiyə ixtisasları üzrə 851 nəfər tələbə təhsil alır. ADPU-nun Şəki filialında tələbələrin seçdikləri ixtisas üzrə yüksəkixtisaslı kadr kimi formalaşmaları və tədris prosesinin normal təşkil olunması istiqamətində lazımi tədbirlər həyata keçirilir.

Qeyd edək ki, ADPU-nun Şəki filialında payız semestrinin imtahan sessiyası 29 dekabr 2015-ci ildən başlamışdır. İmtahan sessiyasının normal təşkili və başa çatması məqsədilə hazırlıq işlərinə vaxtında başlanılmış, tədris planlarına uyğun olaraq, imtahan götürüləcək fənlərdən suallar fənn müəllimləri tərəfindən noyabr ayının əvvəllərində tərtib edilərək müvafiq kafedralara təqdim edilmişdir. Filialda mövcud olan 4 kafedranın hər birinin iclasında müzakirə edilərək təsdiqləndikdən sonra biletlər hazırlanmış və tədris şöbəsinə təhvil verilmişdir. İmtahan cədvəlləri vaxtında tərtib edilərək təsdiqlənmiş, elanlar lövhəsindən asılmışdır. Cədvəl hazırlanarkən fənlərin sıralanmasında tələbələrin istəyi nəzərə alınmışdır. ADPU-nun Şəki filialının direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulovun müvafiq əmrləri ilə imtahanların gedişinə nəzarət edəcək koordinatorlar qrupu müəyyənləşdirilmiş, imtahan qərargahı və münaqişə komissiyası yaradılmışdır. İmtahanların keçiriləcəyi otaqlar müəyyənləşdirilmiş, lazımi avadanlıqlarla təchiz edilmişdir.



İmtahan sessiyasına hazırlığın vəziyyəti ADPU-nun Şəki filialının Elmi Şurasının 16 dekabr 2016-cı il tarixli iclasında geniş müzakirə edilmiş, müvafiq qərar qəbul olunmuşdur.

İmtahan sessiyası zamanı rəhbərliyin xüsusi olaraq diqqət yetirdiyi məsələlərdən biri də tələbələrin imtahana qədər topladıqları balların vaxtında hesablanaraq onların nəzərinə çatdırılmasıdır. Filialda dekanlıq və Kredit sistemi kabineti tərəfindən bu məsələ vaxtında öz həllini tapır və tələbələrin topladıqları ballar hesablanaraq elanlar lövhəsindən asılır.

ADPU-nun Şəki filialında mövcud ixtisasların tədris planlarına uyğun olaraq, imtahan sessiyasının I, II, IV kurslarda, həmçinin"Təhsildə sosial-psixoloji xidmət" və "Məktəbəqədər təlim və tərbiyə" ixtisaslarının III kursunda 29 dekabr 2015-ci ildən 1 fevral 2016-cı ilədək, digər ixtisasların III kurslarında isə 29 dekabr 2015-ci ildən 25 yanvar 2016-cı ilədək keçirilməsi müəyyənləşdirilmiş, Elmi Şuranın 16 dekabr 2015-ci il tarixli iclasında qəbul edilən qərarda bu məsələ öz əksini tapmış, direktorun əmri ilə təsdiqlənmişdir.

İmtahan sessiyasının gedişində tələbələrin valideynlərinin iştirak etmələri, onların öz rəy və təkliflərini bildirmələri üçün lazımi şərait yaradılmışdır.

Məlum olduğu kimi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu (AMİ) Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulmuş və AMİ-nin Ağcabədi, Cəlilabad, Qazax, Quba, Şamaxı, Şəki və Zaqatala filialları ADPU-nun tabeliyinə verilmişdir. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun müvafiq əmri ilə yaradılmış monitorinq qrupları universitetin tabeliyinə verilmiş bütün filiallarda, o cümlədən Şəki filialında imtahanların təşkili və keçirilməsini izləmiş, tədris prosesi ilə bağlı sənədlərin işlənməsi vəziyyətini araşdırmışlar. Bu məqsədlə filialda olan ADPU-nun professorları Rəhim Rzayev, Mais Əmrahov, Ramiz Əliyev, dosent Mübariz Əsədov imtahanların gedişini izləmiş, tələbələrlə imtahanların təşkili, keçirilməsi və qiymətləndirmə ilə bağlı söhbətlər aparmış, öz tövsiyələrini vermişlər.

Onu da qeyd edək ki, filialda imtahanların gedişi prosesi "Kanal S" televiziyası tərəfindən lentə alınmış, 12 yanvar 2016-cı ildə "Günə doğru" verilişində işıqlandırılmışdır.

**Mətbuat və informasiya şöbəsi**

# Nitq mədəniyyəti barədə - I yazı

***Nitq, danışıq kamil olanda, məntiqli və aydın ifadə formasında öz təsdiqini tapanda qarşı tərəfin qəlbinə yol tapa bilir, eyni zamanda qarşı tərəfi ram edərək rahat ünsiyyət qurmağa, münasibət yaratmağa sövq edir. Nitq prosesində kamil nitqin bütün tələblərinə riayət etmək qarşı tərəfin bədii zövqünün, estetik görüşlərinin inkişafına təsir göstərməkdə önəmli rol oynayır.***



Nitq, danışıq fərdidir, hər bir şəxsin özünəməxsusdur. Ancaq hər bir fərdə məxsus olan nitq, danışıq da meyar deyildir. İstənilən bir fikri, informasiyanı, elmi, bədii məlumatı başqalarına çatdırmaq xüsusi bir istedad tələb edən işdir. Ən başlıcası isə bu, mədəniyyətdir. Bütün sahələrin mədəniyyəti olduğu kimi, nitqin də mədəniyyəti vardır. Nitq mədəniyyətindən kənarda qalan nitq kamil nitq deyildir. Nitq mədəniyyətindən kənarda qalan nitq dolğun, məntiqli, aydın, səlis nitq deyildir. Sadəcə olaraq nitqdir, danışıqdır. Mədəniyyəti olan bütün sahələrin, o cümlədən nitqin mədəni tələbləri vardır. Mədəni tələblər çərçivəsində olan mədəniyyət də, nitq də heç kəsin dəyişə bilmədiyi dəyərlər, ölçülər üzərində qurulmalı və inkişaf etməlidir. Kimsə öz nitqində qəbul olunmuş dəyərləri, ölçüləri dəyişirsə, deməli, nitq mədəniyyətinə müdaxilə edir. Kortəbii, süni müdaxilələr qəbul olunmuş formulları dəyişməklə sistem içərisində sistemsizlik yaradır. Ancaq bununla belə, hər bir peşəkar bilir ki, sistem nədir, sistemsizlik nədir. Sistem və sistemsizlik arasındakı ölçülərin itməsi mədəniyyəti, o cümlədən nitq mədəniyyətini kökündən sarsıda bilər. Peşəkarların hər zaman mövcudluğu buna yol vermir, ona görə də nitq mədəniyyəti köklü bir mədəniyyət kimi qavranılır. Köklü mədəniyyət bir dəyər olaraq bütün ölçüləri, prinsipləri üzə çıxarır. Mədəniyyət kimi baxdıqlarımızın, qəbul etdiklərimizin hər biri böyük tərbiyə, təhsil faktıdır. Əslində tərbiyə ən böyük pedaqoqdur. Bunların hamısı öz yerində, ancaq bir məsələ də realdır ki, ən böyük pedaqoqun da, ən böyük natiqin də, ən böyük ideoloqun da nitqə, dilə ehtiyacı vardır. Onların hər biri nitq, dil vasitəsilə həm öz mədəni səviyyələrini, həm peşəkarlıqlarını, həm də bütün üstün cəhətlərini göstərə bilirlər.

Həyatımız informasiyadan kənarda mövcud deyildir. İnsanın informasiyalı cəmiyyətdə formalaşmasında önəmli rol oynayan sahələr vardır: teatr, kino, televiziya, radio, konfranslar, simpoziumlar, mühazirələr, seminarlar və s. Göründüyü kimi, teatr insanın formalaşmasında mühüm rol oynayır. Və teatr dil, nitq mədəniyyətini yaşadan məbədgahdır. Bu məbədgaha əksər vaxt mədəniyyət funksiyasını yerinə yetirən sahə kimi baxılsa da, ancaq nədənsə dil, nitq mədəniyyətini yaşadan, təbliğ edən, irəliyə doğru aparan mərkəz kimi baxılmır. Bunun nəticəsi kimi tamaşaçıların bir qisminin (az olmayan bir qisminin) teatr tamaşalarından uzaq düşmələri nəticə etibarilə onların teatrdakı nitq mədəniyyətindən uzaqlaşmalarına gətirib çıxarır. Vaxtilə uşaq tamaşaları müvafiq teatrlarımızın səhnəsini bəzəyir, uşaqlarımız isə bu tamaşalara səbirsizliklə baxırdılar. İndi isə uşaqlar onların yaş səviyyəsinə uyğun olan tamaşalardan ayrı düşüblər. Belə olduğuna görə orta məktəb uşaqlarının bədii zövqləri ilə yanaşı, dil və nitq mədəniyyəti də geriləyib və geriləyir. Bu da bir faktdır ki, orta məktəbin tədris proqramında olan bədii əsərləin səhnələşdirilənlərinə baxan şagirdlərin sayı azalıbdır. Bu işin bir sistemə çevrilməməsi müəyyən obyektiv və subyektiv səbəblərlə bağlıdır. Onu da nəzərə almaq lazımdır ki, uşaqlara aid olan tamaşalar dil-nitq mədəniyyətinin ən dəyərli mənbələrindən biridir. Uşaqların teatr tamaşalarına getmələri onların inkişafını bir neçə cəhətdən irəliyə doğru aparır. Birincisi, uşaqların zehnini inkişaf etdirir. Zehnin inkişafı isə uşaqların təfəkkürünün, düşüncəsinin inkişafına şərait yaradır. İkincisi, uşaqlar teatr tamaşalarına baxmaqla ünsiyyət qurmaq, duyğu və düşüncələrini ifadə etmək qabiliyyətlərini inkişaf etdirə bilirlər. Təbii ki, ünsiyyət qurmaqda, duyğu və düşüncələrini ifadə etməkdə dil-nitq vacib rol oynayır. Üçüncüsü, bu gün dünyada dili öyrətmək metodu və texnologiyaları gün-gündən inkişaf edir, dəyişir, yeniləşir. Hər halda dili köhnə metod və texnologiyalarla öyrətmək zamanın tələbləri ilə uyuşmur. Ancaq teatr elə bir sahədir ki, o, bütün zamanlarda dilin öyrədilməsində, nitq mədəniyyətinin aşılanmasında və inkişafında həmişə müasir olan metod və texnologiyaları yaşadır. Qeyd etmək istəyirəm ki, cizgi filmləri də bu qəbildən olan vasitələrdən biridir. Daha doğrusu, dili öyrədən tədris üsullarından biridir. Dördüncüsü, dili öyrənmək öyrənilən dilin mədəniyyətinə nüfuz etməkdir. Həm doğma ana dilini, həm də xarici dili öyrənən kəs öyrəndiyi dillərin mədəniyyətinə nüfuz edir. Bu mənada öyrənilən dilin mühiti (tədris mühiti) nə qədər zəngin olarsa, bu da dili öyrənənin dil və nitq mədəniyyətinin inkişafına müsbət təsir göstərə bilər. Bu mənada da teatr zəngin dil mühitini yaşadan, qoruyub saxlayan bir məkandır. Beşincisi, teatr dinləmə, eşitmə mədəniyyətini, məlumat, informasiya əldəetmə mədəniyyətini yaşadan məkanlardan biridir. Onu da qeyd edək ki, eşitmə, məlumat, informasiya əldəetmə mədəniyyətini yaşadan vasitələrdən biri də kinodur. Məsələn, vaxtilə çəkilmiş "Şərikli çörək", "Skripkanın sərgüzəşti", "Gilas ağacı", "Asif, Vasif, Ağasif", "Qaraca qız", "Ögey ana", "Şir evdən getdi", "Qərib cinlər diyarında", "Sehirli xalat", "Bir qalanın sirri", "Əzablı yollarla", "Mən nəğmə qoşuram", "Ağ atlı oğlan", "Pəncərə", "Qırxıncı qapı", "Avqust gələndə", "Adanı özünlə apara bilməzsən", "Qalada tapılan mücrü" və s. kimi uşaq filmləri uşaqların həyatında mühüm rol oynayıbdır. Uşaqlar bu filmlərə baxmaqla onların qəhrəmanlarına oxşamaq istəyir, həyat barədə məlumatlarını artırır, dünyagörüşlərini formalaşdırırlar. Hər bir uşaq öz yolunu tapmaq üçün uşaq filmlərinə baxmağa böyük əhəmiyyət verir. İndi ya uşaq filmləri çəkilmir, ya da çox az çəkilir. Ekranlarda nümayiş olunan uşaq filmləri adlarını yuxarıda çəkdiyimiz filmlərdir ki, onlar da çəkilmə tarixi baxımından köhnə filmlərdir. Bəlkə də uşaqlarda bu tələbatı ödəyə bilmədiyimizə görə onlar mobil telefonların, planşetlərin, o cümlədən kabel televiziyalarının imkanlarından istifadə edərək yaş səviyyələrinə uyğun olmayan filmlərə, seriallara, proqramlara baxırlar. Hər halda uşaqların maraqlarını təmin edən yeni filmlərin çəkilməsinə, telekanallarda uşaq verilişlərinin hazırlanmasına ehtiyac vardır. Vaxtilə uşaqların ehtiyac hiss etdikləri bu boşluqları dolduran müxəlif vasitələr var idi. Məsələn, pioner düşərgələri. Bu düşərgələrdə uşaqlar kollektiv şəkildə böyük bir məktəb keçirdilər. İndi uşaqların təhsilində, tərbiyəsində, dünyagörüşündə hansı qüsurlar varsa, onun hamısını məktəbin üstünə yıxırlar. Hər şeyi məktəbin üstünə yıxmaq olmaz. Yaxşı olar ki, uşaqların bu istiqamətdə maraqlarını təmin etmək üçün televiziya və radioda lazımi verilişlər hazırlansın. İndi dünya elə bir inkişaf səviyyəsinə gəlib çatıbdır ki, yalnız kitabdan oxumaqla, öyrənməklə kifayətlənmək olmur. Həm də baxmaq, seyr etmək, dinləmək də günümüzün reallıqlarıdır. Eşitmək yolu ilə, qulaq yaddaşı ilə öyrənilənlər heç vaxt unudulmur. Bizim hər birimiz eşitmək, dinləmək yolu ilə çoxlu məlumatlar, informasiyalar öyrənmişik. Onların hər biri bizim biliyimizin, dünyagörüşümüzün formalaşmasında mühüm rol oynayıbdır. Bu mənada teatr da telvizor, radio və s. kimi eşitmə, dinləmə, məlumat və informasiya əldəetmə məkanı kimi mühüm rola malikdir. Qulaq elə bir orqandır ki, o, istənilən bir məlumata, informasiyaya həssasdır. Eşitmə prosesində qulaq yaddaşının əvəzsiz rolu da danılmazdır. Bir sözlə, biz eşitdiklərimiz vasitəsilə həm məlumatlanırıq, həm də dil-nitq normalarını öyrənirik. Yeri gəlmişkən onu da qeyd edək ki, eşitdiklərimizin məzmunu, zövqə və ruha nüfuz etmə imkanı da önəmli rol oynayaraq orqanizmə təsir göstərə bilir. Məsələn, belə hesab olunur ki, klassik musiqini dinləmək sinir sisteminə müsbət təsir göstərir. Eyni zamanda insanda yaradıcı təxəyyülü formalaşdırır və inkişaf etdirir, həm də gərginliyin, stressin qarşısını alır. Altıncısı, insan gördüklərini, bildiklərini, eşitdiklərini anlatmağı bacarmalıdır. Anlatmaq üçün danışmaq lazımdır. Anlatmaq danışmaq qabiliyyətindən çox asılıdır. Danışan nədən danışdığını, necə danışdığını, hansı məntiqə söykəndiyini yaxşı bilməlidir. Danışmaq məlumatın, informasiyanın mübadiləsidir. Mübadilə elə bir prosesdir ki, burada yenə də dilə və onun imkanlarına xüsusi önəm verilməlidir. Məlumatı, informasiyanı mübadilə edərkən danışanın söz ehtiyatı mühüm əhəmiyyət kəsb edir. Danışanın söz ehtiyatı zəngindirsə, o, məlumatı, informasiyanı aydın məntiqlə, təsirli bir şəkildə çatdıra biləcəkdir. Əksinə olduqda isə vəziyyət başqa cür olacaqdır. Bu mənada teatr tamaşasında tipik və xarakterik obrazlar iştirak edir ki, onların hər birinin öz dili, nitqi onların daxili aləmlərini, mənəvi zənginliklərini, cəmiyyətdəki mövqelərini, ictimai-iyasi düşüncələrini aça bilir. Burada yenə də dil, nitq önəmli rol oynayır, tamaşaçıya obrazların tipik xüsusiyyətləri dil, nitq vasitəsilə çatdırılır. Yenə də burada teatr və teatr tamaşası mühit rolunu oynayır. Obrazlar dil və nitq ilə tamaşaçının dil, nitq mədəniyyətini formalaşdıra bilir. Yeddincisi, teatr tamaşası gözlə görməkdən, qulaqla eşitməkdən ibarət olmaqla əslində bir oxu mədəniyyətidir. Göz və qulaq istənilən bir tamaşanı əvvəldən axıra qədər oxuyur. Qulaq təkcə dinləmir, o həm də eşitdiklərini oxuyur. Teatr tamaşasında eşidilən və görülən hər bir şey oxunur. Bu prosesdə insan oxuduqlarını bir-bir beynində təhlil edir, fərdi şəkildə analiz aparır, nəticədə söz ehtiyatı, lüğət tərkibi zənginləşir. Ola bilməz ki, müntəzəm şəkildə teatr tamaşalarına gedən hər hansı bir insanın dünyagörüşü, mədəniyyəti ilə yanaşı dili, nitqi zənginləşməsin. Bu mühit dilin, nitqin imkanlarına geniş meydan verir. Eşitmək, danışmaq, oxumaq qabiliyyətinə yiyələnə bilməyənlər heç zaman yazmaq qabiliyyətinə də qadir ola bilməzlər. Eşitmək, danışmaq, oxumaq birlikdə yazmaq üçün bazadır. Bir sözlə, teatra təkcə mədəniyyət kimi deyil, həm də eşitmək, danışmaq, oxumaq, yazmaq vərdişlərini aşılayan bir sahə kimi baxmaq lazımdır. Ona görə də teatrın nitq mədəniyyətinin inkişafına müxtəlifyönlü təsirini önəmli hesab etməmək mümkün deyildir. (bax: Niyaz Cəfərov. Teatrın dili və ya dilin teatr formulu - "Kaspi" qəzeti, 6 mart 2015, 043(3354), s.10).

*(Davamı gələn sayımızda)*

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

# Səməd bəy Mehmandarov - nəsillərə örnək sərkərdə



XIX əsrin əvvəllərində Azərbaycan torpaqlarının Rusiya imperiyası tərəfindən işğalı ilə Azərbaycan xalqının siyasi müstəqilliyinə son qoyuldu, Azərbaycan ərazilərinin bir hissəsi erməniləşdirildi, sərhədyanı bölgələrə ruslar köçürülərək ruslaşdırma siyasəti yeridildi. Qraf Paskeviç tərəfindən İrana göndərilən La-zarev 40 min erməninin Zaqafqaziyaya köçürülməsinə nail ol-du. Onlardan 18 mini Qarabağda yerləşdirildi. A.S.Qribo-ye-dov bu münasibətlə yazırdı ki, «ermənilər əksərən Azərbaycan tor-paqlarında yerləşdirildilər. Köçkünlər özləri darısqal yaşayır və mü-səl-manların yerini darısqal edirlər, müsəlmanlar əməlli-başlı şi-ka-yət-lə-nirlər».

Azərbaycan xalqı uzun illər öz dövlətçiliyindən məhrum oldu, siyasi, iqtisadi və mənəvi buxovlar altında inildədi, lakin ümidini itirmədi, milli-mənəvi dəyərlərini qorudu və nəsillərə ötürdü.

**Böyük yunan filosofu Lukian demişdir ki, Vətəni böyük və ki-çikliyinə, daşlı-kəsəkli olmasına görə deyil, yetirdiyi qəh-rə-man-lara görə tanıyırlar.** Qəhrəmanların igidliyi ölməzdir. Onların xa-tirəsi insanların qəlbində yaşayır, qəhrəmanlıq rəmzi kimi gənc-lər--də vətənpərvərlik hissinin formalaşdırılmasında, Vətənin mü-da-fiə-sində əvəzsiz rola malikdir.

Qəhrəmanlıq tarixinə dair minlərlə nümunə vardır. Xalqı-mı-zın qəhrəman oğulları işğalçılara qarşı son damla qanlarına qədər vuruş-muş, canlarını Vətən yolunda qurban vermişlər. Ərəb iş-ğal-la-rı-na, monqol zülmünə, Teymurun ordusuna, Azərbaycanı ələ keçir-mək uğrunda vuruşan İran və rus qoşunlarına qarşı xalqımızın mərd oğulları cəsarətlə vuruşdu, adlarını dünya tarixinin qızıl səhi-fələrinə yazdılar.

Hərbi işi Azərbaycan xalqının, bütövlükdə Türk dünyasının qəhrəmanlıq keçmişi, qürur mənbəyi olduğunu anlayan imperiya ideoloqları hərbi işin davam etdirilməsi, hərbi ənənələrin inkişaf etdirilməsinin milli mübarizlik şüurunun formalaşmasında ciddi amil olduğunu bildiklərindən xalqın hərbi vərdişlərinin unutdurulması məqsədilə azərbaycanlı əhali hərbi xidmətə cəlb edilmədi. Bəzən kitablarda, hətta ayrı-ayrı ziyalıların çıxışlarında belə bir fikir irəli sürülür ki, Çar Rusiyasının azərbaycanlı əhalinin hərbi xidmətə cəlb etməməsinin əsas səbəblərindən biri azərbaycanlılara etibar etməməsindən və onlara silah tapşırılarsa, çarizmə təhlükə törədə bilmələrindən irəli gəlirdi. Bu fikirlərlə bir tərəfdən razılaşsaq da, əslində həmin addımı atmaqla çarizm xalqın milli-mənəvi ruhunu məhv etmək istəyirdi. Çünki hər bir xalqın milli-vətənpərvərlik hissinin fomalaşmasında və həmin hisslərin milli hərəkatın mərkəzində dayanmasında hərbi işin böyük rolu vardır. Doğrudur, azərbaycanlı bəy-xan övladlarının hərbi qulluqda olmaları barədə faktlar çoxdur, bu isə ondan irəli gəlirdi ki, çarizm onları əslində, özlərinin yerlərdəki dayaqları hesab edirdi. O şəxslər hərbi xidmətə buraxılırdılar və ya cəlb edilirdilər ki, onlar özləri hərbi işə meyil edirdilər. Bu gün fəxrlə deyə bilərik ki, onlar arasından elə sərkərdələr yetişmişdir ki, həmin şəxslərin əksəriyyətində milli keyfiyyətlər son dərəcə yüksək olduğundan ən mürəkkəb mühitdə belə millətimizə xas olan keyfiyyətləri qoruyub saxlaya bildilər. Belələrinə Naxçıvanskilər nəsli nümunədir. Vitse-admiral Aslanbəyov, tam artilleriya generalı Səmədbəy Mehmandarov, general-leytenant Əliağa Şıxlinski və başqaları Azərbaycan xalqının fəxri olan şəxsiyyətlərdir. Heç də düşünmək lazım deyildir ki, onların əksəriyyəti çar Rusiyasının ordusunda xidmət etdilər, müharibədə hərbi əməliyyatların uğur qazanmasında, bütövlükdə imperiyanın qələbələrində əhəmiyyətli rol oynadılar, bununla bərabər Azərbaycan müstəqillyini itirdiyi illərdə belə xalqın hərb ənənələrini yaşatdılar, xalqda hərb işinə marağın sönmədiyi nümayiş etdirdilər.

**Vaxtilə rus ordusunda xidmətdə olanlar Azərbaycan Xalq Cümhuriyəti qurulandan sonra Azərbaycan Milli Ordusunun yaradılmasında və ərazi bütövlüyü uğrunda mübarizə də ön sıralarda oldular.** Bəli, bugünkü Azərbaycan Ordusu Azərbaycan Xalq Cümhuriyəti ordusunun varisidir və qətiyyətlə deyə bilərik ki, bu ordunun ənənələrini yaşadanlar Mehmandarovların, Şıxlinskilərin varisləridir.

Azərbaycan xalqı, gündən-günə öz gücünü artıran, təkmilləşən, dünya standartlarına uyğun olaraq hərbi qüvvələrini yetişdirən Azərbaycan Silahlı Qüvvələrinin şəxsi heyəti 2015-ci ildə görkəmli sərkərdə Səməd bəy Mehmandarovun anadan olmasının 160 illik yubileyini sərkərdəyə layiq tərzdə qeyd etdi. **General Səməd bəy Mehmandarovun 160 illik yubileyinin keçirilməsi haqqında Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 29 sentyabr 2015-ci il tarixli Sərəncamı** bir daha sübut edir ki, müstəqilliyini bərpa etmiş Azərbaycan xalqı hansı dövrdə, hansı siyasi quruluşda yaşamasına və fəaliyyət göstərməsinə baxmayaraq, öz qəhrəman və istedadlı oğullarını unutmur və unutmayacaqdır.

Professor Əkrəm Cəfər yazırdı ki, «Bizim keçmişdə başqa xalqların qibtə etmələrinə layiq böyüklərimiz çoxdur. Əgər biz istəyirik ki, gələcəkdə bizim xalqımızdan böyük şəxsiyyətlər yetişsin, həmin böyükləri müasirlərimizə, gənclərimizə yaxşı tanıtmalıyıq. Keçmişə məhəbbət gələcəyə xidmətdir» (7,səh.122). Bu baxımdan, Səməd bəy Mehmandarovun həyatının və hərbi xidmət yolunun öyrənilməsi Azərbaycan xalqının qəhrəmanlıq tarixinin öyrənilməsi və gənclərin hərbi- vətənpərvərlik tərbiyəsi baxımından xüsusi əhəmiyyət kəsb edir. Çünki S.Mehmandarov həyatı boyu tutduğu bütün vəzifələrdə özünün hərbçilik məharətini göstərməklə mənsub olduğu xalqın keyfiyyətlərini nümayiş etdirmiş, özünə və tabeliyində olanlara qarşı prinsipiallığı, tələbkarlığı, hadisələrin inkişafını öncədən görmək qabiliyyəti, verilən vəzifələrin icrasına məsuliyyətlə yanaşması, bir sözlə,insani keyfiyyətləri yetişməkdə olan nəslə nümunədir.

*(Davamı 6-cı səhifədə)*

# Səməd bəy Mehmandarov - nəsillərə örnək sərkərdə

(Əvvəli 5-ci səhifədə)

S.Mehmandarovun irsini öyrənməklə gənclərimiz tapşırılan işə məsulliyətlə yanaşmalı, ümumi mənafeyi şəxsi mənafedən üstün tutmalıdırlar.

S.Mehmandarov haqqında yazılar o qədər də çox deyildir. Bəlkə də bu onun hərbiçi olması ilə bağlıdır. Ancaq S.Mehmandarovun istər Cümhuriyyətə qədər, istərsə də ondan sonrakı fəaliyyəti barədə istifadəmizdə olan mənbələrin və Rusiya arxivlərində saxlanılan sənədlərin dövriyyəyə cəlb edilməsi vacibdir və bu sahədə sanballı iş görmüş Hacıağa İbrahimbəyliyə, mərhum polkovnik Əli Abbasova, istedadlı tədqiqatçı, yazıçı-jurnalist Şəmistan Nəzirliyə və hərb tarixi üzrə mütəxəsis, Azərbaycan Respublikasının İran İslam Respublikasında hərbi atteşesi, tarix üzrə elmlər doktoru, polkovnik Mehman Süleymanova minnətdarlıq edirik.

Mehmandarovun həyat yolunun izlənilməsində xatirələr mühüm yer tutur. Bu xatirələrin içərisində P. Larenkonun «Port-Arturun əzablı günləri» (Stradnıe dni Port-Artura»), Ə.Şıxlinskinin «Xatirələrim» kitabları xüsusi maraq doğurur.

Mehmandarov soyadının yaranması barədə müxtəlif fərziyyələr mövcuddur. Onlardan biri ondan S.Mehmandarova həsr edilmiş kitablardan ibarətdir ki, Qarabağ xanlığının idarəetmə aparatında olan bir çox hərbi və mülki vəzifələrdən biri də mehmandar vəzifəsi idi. Mehmandarlar saraya elçiliyə, səfərə, qonaq gələn adamları xanlığın sərhədlərində qarşılayır və birbaşa ölkənin paytaxtına gətirirdilər (3,səh.45). Qarabağ xanı Ibrahimxəlilxan Cavanşirin (1762-1806) mehmandarı olmuş Mirzə Əli bəyin törəmələri sonralar Mehmandarov soyadını daşıdılar. Vəli bəy Hüsülü də mehmandar vəzifəsində çalışmışdı. Onun törəmələri də Mehmandarov soyadını qəbul etdilər.

Təzkirəçi Məhəmmədağa Müctəhidzadə xatirələrində Mehmandarov soyadının Mirzə Əlibəyin səxavətli, qonaqpərvər olduğuna görə yarandığını yazırdı. Mehmandarovların bir qolu sonralar Lənkəran şəhərinə köçdü. Şuşada doğulan Mirzə Səməd bəy Mehmandarovun atası Sadıq bəy Mehmandarov Sankt-Peterburqda hüquq fakültəsini bitirdi və orada Hacı Mir Abbasbəy Talışinski ilə tanış oldu. Hacı Mir Abbas onu Lənkərana, öz mülkünə baş hüquqçu vəzifəsində işləməyə dəvət etdi və sonradan Mirzə Sadiq bəy Talışınskilərdən evləndi. Bu soyun tanınmış nümayəndələrindən olan həkim Kərim bəy Mirzə Mustafa bəy oğlu Mehmandarov 1854-cü ildə Şuşa şəhərində doğulmuş, 1872-ci ildə Bakı şəhər gimnaziyasını bitirərək Sankt-Peterburq Tibb Cərrahlıq Akademiyasına daxil olmuşdu. 1877-ci ildə akademiyanı tamamlayıb Sankt-Peterburq klinik hərbi xəstəxanasında həkim işləyən Kərim bəy 1873-cü ildə Azərbaycana dönərək Yelizavetpol (Gəncə) quberniyasının Cavanşir qəzasında həkim kimi çalışdı, sonradan Şuşa şəhərində həkimlik fəaliyyətini davam etdirdi. Kərim bəy Şuşada ictimai işlərdə fəallıq göstərərək «Difai» partiyasının Şuşa şöbəsinə sədrlik etdi. Kərim bəy Mirzə Mustafa bəy oğlu Mehmandarov 1929-cu ildə vəfat etmişdir.

Kərim bəy əvvəl Aleksandra Mixaylovna Dolqanova ilə ailə qurdu. Bu izdivacdan Mixail adlı oğlu dünyaya gəldi. Ikinci dəfə Bəhmən Mirzə Qovanlı-Qacarın qızı Zəri xanımla evləndi. Ikinci nikahdan Ədil bəy, Rəşid bəy, Surxay bəy adlı oğulları, Turan xanım, Kübra xanım, Nüşabə xanım və Məhbubə xanım adlı qızları dünyaya gəldi.

Səməd bəy Sadıq oğlu Mehmandarov 1855-ci il oktyabrın 16-da anadan olmuşdur. Atası əslən Qarabağlı olsa da, tale onu Cənubi Azərbaycana atmışdı. Sadıq bəy imkanlı şəxs idi. Onun elmə və təhsilə dərin marağı olmuşdur.

Səməd bəy ilk təhsilini Bakıda realnı məktəbdə aldı. Təhsil dövründə rus dilini mükəməl öyrənən kiçik Səməd təhsilini Rusiyada davam etdirməyi qərarlaşdırdı. O, zadəgan ailələrinə daxil olduğundan Peterburqda hərbi məktəbə daxil olmaqda çətinlik çəkmədi və 1871-ci ildə Peterburqa gedərək Konstantin Hərbi Məktəbinə daxil oldu. **(5, səh. 11)**

Səməd bəy 1876-cı ildə 2-ci Konstantin hərbi məktəbini bitirdi, ilkin zabit rütbəsi olan praporşik rütbəsi aldı və 1-ci Türküstan topçu briqadasında batareya komandiri kimi hərbi xidmətə başladı. Az müddətdən sonra növbəti rütbəyə layiq görüldü. Səməd bəyin xidmət etdiyi briqada 1876-1878-ci illərdə çar ordusunun Orta Asiyada işğalçılıq planlarının həyata keçirilməsində iştirak etdi. Onun komandanlıq etdiyi briqada yüksək peşəkarlıq göstərdi və Səməd bəy III dərəcəli «Stanislav» ordeni ilə təltif olundu **(5, səh.11).**

Səməd bəy elmin və təhsilin tərəfdarı idi. 1892-ci ildə qəzetdə çap olunan «Müsəlmaların geriliyi» adlı ilk məqaləsi, 1894-cü ldə çap olunan «Nə etməli», «İbtidlai qiraət dərsləri» və «Müsəlman mühafizəkarlığı əleyhinə» məqalələri göstərir ki, xalqının dərdləri haqqında düşünən ziyalı-hərbçi Səməd bəy müsəlman xalqlarını bürümüş cəhalətə, fanatizmə qarşı çıxış edərək təhsilin və maarifin davam etdirilməsini, xüsusilə də, qızların təhsilə cəlb edilmələrini zəruri bilirdi. Mehmandarovun məqalələrində əksini tapmış maarifçilik ideyaları ilə R.Əfəndiyev, P.Vəlibəyov, T.Bayraməlibəyov, F.Köçərli, Ə Cavanşir və digər ziyalılarla bir sırada dayanır.







Səməd bəy XX əsrin əvvəllərində Zabaykal əlahiddə topçu diviziyonunda xidmət edirdi. İki batareyadan ibarət divizyonunn komandiri polkovnik Şimilin idi. Birinci batareyanın komandiri podpolkovnik Engelman, ikinci batareyanın komandiri Səməd bəy idi. 1898-ci ildə polkovnik rütbəsi alan Səməd bəy xidməti zamanı Əliağa Şıxlinski ilə rastlaşır. O zaman Ə.Şıxlinski birinci batareyada xidmətə başlamışdı.

Zabaykal diviziyasında xidmət edərkən S.Mehmandarov hərbi əməliyyatlarda iştirak etdi. Belə ki, 1899-1901-ci illərdə Çində antiimperialist üsyanlar başlayır. Bu üsyanlar böyük dövlətləri, o cümlədən Rusiyanı qorxuya salır. Bu səbəbdən də təhlükəni yerində məhv etmək məqsədilə Çin ərazisinə hərbi qüvvələr göndərilməsi qərara alınır və yaradılmış xüsusi dəstəyə general-mayor Rennenkamf komandan təyin olunur. Zabaykal diviziyonu bu dəstənin tərkbinə daxil edilir. Divizion 1900-cu il iyunun əvvələrində döyüş bölgəsinə hərəkətə başlayır.

S.Mehmandarovun batareyası ilk tapşırıq kimi Maxo şəhərini tərksilah etdi. Çin üsyançıları rus qoşunlarına müqavimət göstərə bilmədilər. İyunun 19-da Blaqoveşenski şəhəri ələ keçirildi. Qoşunlar Blaqoveşenskidə dayanarkən general Rennenkamf 40 kazak və S.Mehmandarovun batareyasında olan iki topla irəli hərəkət etdi. Onlar Zürə çayında bir üsyançı dəstəsini məğlub edərək Kiçik Xinqan dağının ətəklərində döyüşə girdilər. Ancaq məlum oldur ki, üsyançıların müqavimətini qırmaq mümkün olmayacaq. Belə olan halda arxada qalan qüvvələrdən S.Mehmandarovun batareyası bütünlüklə, birinci batareyanın bir hissəsi və bir süvari tabor generalın köməyinə göndərildi.

Avqusun 3-də üsyançılarla növbəti döyüş baş verdi. Ancaq S.Mehmandarovun batareyasının meşədə gizəldilməsi qərara alındığından döyüşdə iştirak etmədi. Amma üsyançıların meşəni əvvəlcədən minalaması nəticəsində S.Mehmandarovun dəstəsi meşəyə yaxınlaşanda partlayış baş verdi, batareyanın 2 əsgəri həlak oldu. Bir neçə gündən sonra üsyançıların müqaviməti qırıldı. Mehmandarov Sisikara şəhəri uğrunda döyüşlərdə iştirak etdi. Lakin üsyançılar müqavimətin mənasızlığını başa düşərək silahlarını qoyub şəhərdən çıxmağa başladılar. Rennenkamf S.Mehmandarova onlara atəş açmağı əmr etsə də, atəş açılmadı. Ə.Şıxlinski yazır ki, S.Mehmandarov atəş açmaqdan imtina etdikdə Rennenkamf əmr verdi ki, əmri yerinə yetirməyən komandir məhkəməyə veriləcək. Mehmandarov silahsız çinlilərin başı üstündən bir neçə dəfə atəş açdırdı. Çinlilər dərhal geri qayıtdılar. (7, səh.127)

Çin ərazisində döyüş tapşırıqlarının icrası zamanı göstərdiyi peşəkarlığa və məharətə görə S.Mehmandarov 3-cü dərəcəli «Vladimir» ordeni ilə təltif edildi.S.Mehmandarovun komandir olduğu ikinci batareya Xarbin qarnizonunda saxlanıldı. 1902-ci ilə Səməd bəy artıq polkovnik rütbəsində idi (5, səh.19). Həmin ilin may ayında ona 6 aylıq məzuniyyət verildi və məzuniyyətini Sankt-Peterburqda keçirdi. Məzuniyyət dövründə jitomirli Yelizaveta Nikolayevna Teslavla ailə həyatı qurdu **(7,səh.127).** Şəmistan Nəzirlinin yazdığına görə,o vaxt Y. Nikolayevnanın 20-21 yaşında olduğu güman edilir. O, da zadəgan ailəsindən idi, qadın gimnaziyasını bitirmişdi **(7, səh.128).** Aralarında böyük yaş fərqi olmasına baxmayaraq, onların səmimi ailəsi vardı və onların Pir (sonralar İqor adı daşıdı) adında oğulları dünyaya gəldi. Məzuniyyət müddəti bitdikdən sonra S.Mehmandarov zabitlər kursuna göndərilməsini xahiş etdi və daha 7 ay topçu kursunda təhsil aldı. Mərhum polkovnik Əli Abbasov yazır ki, Səməd bəy kursda olarkən nəzəri və praktiki hazırlığını təkmilləşdirdi. 1903-cüilin noyabrında öz batareyasna qayıdan Səməd bəyin həyatında böyük dəyişikliklər baş verdi. Hissədə onu başqa bir sevinc də gözləyirdi. Çin döyüşlərinə görə Mehmandarov üzərində «İgidliyə görə» sözləri yazılımş Qızıl qılıncla mükafatlandırıldı **(5, səh.20).** Mehmandarov Sankt-Peterburda olarkən onun batareyasına Ə.Şıxlinski rəhbərlik etmişdi.

1904-cü ildə Port-Artur döyüşü başlayanda Səməd bəy başqa bir vəzifəyə təyin edildi və Ə.Şıxlinski yeni komandir gələnə qədər batareyaya rəhbərliyi davam etdirdi.

Port-Artur haqqında kifayət qədər yazıldığını nəzərə alaraq deyək ki, Port-Artur strateji bir mövqe idi. Sakit okeana açılan Sarı dənizlə dar körfəzi dar boğaz birləşdirirdi və onu dəniz qüvvələrindən asanlıqla qorumaq mümkün idi. Heç vaxt donmayan Port-Artur Sibir dəmir yolu ilə birləşdirildiyindən nəqliyyat əlaqələri baxımından da strateji məntəqə idi. Ona görə də Port-Artura sahib olmaqla Kvantun yarımadasının bir hissəsini, o cümlədən dəniz hövzəsini nəzarət altına almaq mümkün idi. Sadaladığımız amillər üzündən orada nəzarəti ələ keçirmək üçün Yaponiya XIX əsrin sonlarında Çinlə müharibəyə başladı, 1895-ci ildə bağlanmış müqaviləyə görə Yaponiya yarımada ilə Port-Artur üzərində nəzarəti ələ keçirdi. Lakin Rusiya və digər dövlətlərin təzyiqi ilə Yaponiya bu niyyətindən əl çəkdi, əvəzində Rusiya Çin ilə razılaşaraq Port-Arturu 25 illik icarəyə götürdü. Bununla bağlı 1898-ci ilin martında iki dövlət arasında müvafiq sənəd imzalandı. Yaponiya belə bir vəziyyətlə razılaşa bilmirdi və bəlkə də öz nüfuzunu bərpa etmək üçün 1904-cü il martın 27-də rus gəmilərinə hücum etdi. Müharibənin başlanması 48 yaşlı S.Mehmandarovun dinc həyatını pozdu.

Prot-Arturun müdafiə döyüşlərinin strukturu **(5,səh.26)** Port-Artur uğrunda döyüşlər faciə ilə başa çatdı. Məsələnin əsil mahiyyəti isə belədir. 1904-cü il dekabrın 21-də şəhəri müdafiə edən qarnizon müqaviməti dayandırdı. Cəsarətsiz general Stessel zabitləri eşitmədi, silahı yerə qoymağı əmr etdi. Yaponlar dekabr ayının 23-də şəhərə daxil oldular.Yaponların şərtlərinə görə, əsgərlər əsir alınır, zabitlər isə Yaponiyaya qarşı bir daha müharibədə iştirak etməyəcəkləri barədə yazılı iltizam verəndən sonra Rusiyaya qayıda bilərdilər. Stesselin ətrafındakılar belə bir iltizam verdilər. S.Mehmandarov və onun zabit dostları isə qala təslim edildikdə sonra hərbi anda sadiq qalaraq əsgər və zabitlər üçün nümunə göstərdilər.Həmin gün Mehmandarov və onun topçuları hər şeyi təhvil verərək yaponlara təslim oldular. 7-ci Şərqi Sibir nişançı topçu diviziyonundan 544 əsgər və onlarla birlikdə 14 zabit könülü olaraq yaponlara əsir düşdülər. Qalanın təslim edilməsinin və evə getməyin kəskin əleyhdarı olan Mehmandarov əsirliyə yollandı. **(7, səh.128).**

Mehmandarov digər əsirlərlə bərabər Naqaya şəhərinə gətirildi. Yalnız 1906-cı ilin avqustunda Portsmut sülh müqaviləsi bağladıqdan sonra Rusiyaya qayıtdı. Mehmandarov Rusiyaya qayıdan kimi dərhal hərbi xidmətə başladı. Port-Artur döyüşlərində göstərdiyi şücaətlərə görə bir sıra zabitlərlə birlikdə general rütbəsindən əlavə «Müqəddəs Georgi» ordeninin 4-cü dərəcəsinə layiq görülən Mehmandarova yüksək vəzifə verildi. Təxminən iki il ərzində 75-ci topçu briqadasına rəhbərlik etdi. Sonradan briqada 7-ci Şərqi Sibir topçu briqadası adlandırıldı.

Rus-yapon müharibəsində məğlubiyyətin səbəblərindən danışarkən rus ordusunda mövcud olan zabitlərin xarakterinə diqqət yetirmək vacibdir. Başqa sözlə, əslində bu müharibə xarakterlərin mübarizəsi idi. Bu mübarizənin bir qütbündə general Kondratenko, general Nadein, general İrman və general Mehmandarov kimi zabitlik şərəfinə sədaqət göstərən şəxslər vardısa, digər tərəfdə bölgənin canişini Alekseyev, qala komendantı Stessel, onun köməkçisi general Fok kimi iradəsiz, əsgər və zabit şərəfinə laqeyd yanaşanlar dayanmışdı.

Port-Arturda məğlubiyyət tək hərbçilər arasında deyil, bütün Rusiya cəmiyyətində narazılığı gücləndirdi. Bundan istifadə edən bolşeviklər cəmiyyətdəki qüvvələrin balansını dəyişməyə cəhd göstərdilər. Bir qrup isə məğlubiyyətin səbəblərini araşdırmağı və günahkarların cəzaladırılmasını tələb etdilər.

1907-ci ildə Sankt-Peterburqda Port-Arturun məğlubiyyətində təqsirkar bilinən şəxslərin, o cümlədən Stesselin məhkəməsi oldu. Başqa zabitlər kimi Mehmandarov da məhkəməyə dəvət olundu. O, öz ifadəsində müdafiədə buraxılmış səhvləri göstərdi və günahkarlar cəzalandırıldılar. Təbii ki, Port-Arturda əldə olunmuş acı təcrübə topçu qüvvələrin strukturlarının təkmilləşməsinə səbəb oldu. 1910-cu ildən başlayaraq Rusiya ordusunda struktur dəyişikliyi aparıldı.

Birinci Dünya müharibəsi ərəfəsində Mehmandarov 1-ci Qafqaz korpusunun topçu rəisi təyin edildi. Korpusun tərkibində topçular çox idi. Müharibə ərəfəsində korpusun sərəncamına ağır toplar verilməyə başlandı. Birinci Dünya müharibəsi başlayanda S.Mehmandarov artıq piyada diviziyasının komandiri idi.

Mehmandarovun bu dövr üçün xarakteristikası maraqlıdır. Onun akademiya təhsili yox idi, ancaq bacarığı ilə yüksəkdə dayanırdı. Müharibə illərində Səməd bəy tam artilleriya generalı rütbəsinə layiq görüldü. Digər tərəfdən, Mehmandarov müharibə illərində sırf topçu vəzifəsində olmadı, ümumqoşun komandanlığı vəzifəsində xidmət etdi. O, əvvəlcə 21-ci piyada diviziyanın komandiri, sonra operativ dəstə komandiri və nəhayət, 2-ci Qafqaz korpusunun komandiri oldu. **(5, səh.50-51)**

Birinci Dünya müharibəsi cəbhəsində Mehmandarovun komandanlıq etdiyi 21-ci piyada diviziyası Varşava-İvanqorod əməliyyatında iştirak etdi. Lodz şəhəri ətrafında hərbi vəziyyətin xeyli mürəkəb olmasına baxmayaraq, Mehmandarov bu istiqamətdə almış olduğu tapşırığın icrasına bütün qüvvəsini sərf etdi. Lodz ətrafında döyüşlər rus qoşunlarının uğuru ilə nəticələndi.

Mehmandarovun iştirak etdiyi digər əməliyyatlardan biri 1914-cü ilin sentyabrından İvanqorod ətrafında aparılan əməliyyatlar oldu. Mehmandarov 1914-cü ilin sonuna kimi 21-ci piyada diviziyasının komandiri oldu. İlin sonunda 21-ci diviziyanın komandirliyini təhvil verən Səməd bəy birləşmiş əməliyyat dəstəsinə rəhbərlik etməyə başladı.

1914-ci ildə Səməd bəy 2-ci Qafqaz korpusnun komandiri təyin edildi. Bu onun korpus komandiri kimi çar orduunda sonunucu vəzifəsi idi. Bir vaxlar 2-ci Qafqaz korpusunda xidmət etmiş və Səməd bəy haqqında kitabın müəllifi H.İbrahimbəyli yazır ki, onunla görüşməsəm də, tələbkarlığı haqqında eşitmişdim. 1915-ci ildə xidmət etdiyim süvari hissə müvəqqəti olaraq 2-ci Qafqaz korpusuna verildi. Bu korpusun komandanı topçu generalı Mehmandarov idi. Ə.Şıxlinski onunla birlikdə xidmət etməsə də, onun haqqında maraqlı anları xatırladırdı.

1917-ci ilin fevralında baş verən inqilab Mehmandarovun həyat və xidmət yolunu dəyişdi. O, rus ordusundan istefa verdi. Xidmət dövrü ərzində tam artilleriya generalı rütbəsinə yüksələn soydaşımız «Müqəddəs Georgi» ordeninin 3-cü və 4-cü dərəcələri, «Stanislav» ordeninin 1-ci və 2-cə dərəcələri, «Vladimir» ordeninin 2,3 və 4-cü dərəcələri, «Ağ qartal» və «Aleksandr Nevski» ordenləri ilə, habelə briliantlarla bəzədilmiş qızıl silahla təltif edildi.

İstefaya çıxdıqdan sonra Səməd bəy Vladiqafqazda yaşadı. Bolşeviklər Vladiqafqazı ələ keçirdikdən sonra Azərbaycana gəlməyi qərara aldı. H.İbrahimbəyli kitabında yazır: «Tbilisi vağzalında duran Batumi-Bakı qatarı yola düşməyə hazır idi. Vaqon xidmətçisi mənə iki adamlıq kupedə yer verdi, bu yerlərin biri tutulmuşdu: burada kiçik bir çamadan, bir yorğan-döşək bağlaması və bir boz general plaşı qoyulmuşdu.

Qatarın yola düşməsinə 20 dəqiqə qalmışdı. Birinci sinif vaqonun qabağında orta boylu, ağsaqqallı bir kişi durmuşdu. Bu kişi general paltarında idi və boynundan Georgi xaçı asılmışdı. Bir qədər yana qoyulan papağının altında ağ saçı görünürdü. Mən salam verib generalın 10-12 addımlığında dayanaraq qatarın yola düşməsini gözləyirdim. Bu adam general Mehmandarov idi...

Mehmandarov yaxşı yol yoldaşı və söhbətcil idi. O mənimlə bəzən rusca, bəzər azərbaycanca danışırdı. Mehmandarovun söhbətindən məlum oldu ki, 1917-ci ilin fevral iqilabından sonra hərbi qulluqdan çıxıb, Vladiqafqaz şəhərində dinc həyat çürməyə başlayıbmış. O burada yaralılara kömən edən Aleksand komitəsinin üzvü imiş. 1918-ci ilin avqust ayının əvvəllərində Şimal Qafqazda Sovet hakimiyyəti qurulduqdan sonra bu komitə ləğv edilmiş və Mehmandarov Hərbi Gürcüstan yolu ilə Tbilisiyə gəlmişdi. O, indi buradan Azərbaycana qayıdırdı". **(5,səh.56)**

S.Mehmandarov Azərbaycana qayıdanda ölkədə mürəkkəb ictimai-siyasi vəziyət mövcud idi. Sosial strukturda da dəyişikliklər baş verirdi. Yeni siniflər-bur-juaziya və proletariat formalaşırdı.

1917-ci il noyabrın 9-12-də Bakıda Müsavat partiyasının rəhbərliyi ilə Zaqafqaziya Müsəlman Milli Komitəsinin milli təsis yığıncağı ke-çirildi. Yığıncaq millətin taleyini həll etmək üçün bütün canlı qüv-vələrin birləşdirilməsini, Rusiya Federasiyasında yeni muxtar vahidin yaradılmasını tələb etdi. Lakin Bakı Sovetinin hakimiyyəti şəhər kənarından uzağa getmirdi. Zaqafqaziyanın qalan hissəsini 11 noyabr 1917-ci il tarixdə OZAKOM-un əvəzində yaradılmış Zaqafqaziya Komissarlığı idarə edirdi. Zaqafqaziya hökumətinə E. Qeqeçkori rəhbərlik edirdi. Hökumətə Azərbaycandan 3 nümayəndə - F.X. Xoyski, M.Y. Cəfərov, X.Xasməmmədov daxil idi.

1918-ci il fevral ayının 23-də Tiflisdə Zaqafqaziya Seymi işə başladı. Onun tərkibinə Zaqafqaziyadan Ümumrusiya Təsis Yı-ğın-ca-ğına seçilmiş

(Davamı 7-ci səhifədə)

# Səməd bəy Mehmandarov - nəsillərə örnək sərkərdə

(Əvvəli 6-cı səhifədə)

deputatlar daxil oldular. Azərbaycan fraksiyasına bir-ləşən 44 deputat əsasən «Müsavat», «İttihad», «Hümmət» və so-sia-list blokunu təmsil edirdilər. Azərbaycan fraksiyasının lideri M.Ə. Rəsulzadə idi.

1918-ci il aprelin 22-də Zaqafqaziya müstəqil federativ respub-li-ka elan edildi. Aprelin 26-da Çxengelinin rəhbərliyi altında yeni hö-kumət təşkil edildi. Zaqafqaziyanın yeni hökumətinəAzərbay-ca-nın 5 nəfər nümayəndəsi - F.X.Xoyski (ədliyyə naziri), H.Məli-kas-la-nov (yollar naziri), N.Yusifbəyov (maarif naziri), M.H. Hacınski (ti-ca-rət və sənaye naziri), İ.Heydərov (dövlət nəzarətçisi) daxil edil-di-lər.

Zaqafqaziyanın müstəqilliyinin elan olunması xəbəri Mosk-va-da və Bakıda hakimiyyəti ələ almış bolşeviklərin və daşnakların na-ra-hatlığına səbəb oldu. Onlar milli qüvvələri məhv etmək, öz hakimiy-yət-lərini bütün Azərbaycana yaymaq məqsədilə işğal olunmuş Bakı qu-berniyasında proletariat diktaturasını möhkəmləndirmək üçün aprelin 24-də Bakı Xalq Komissarları Sovetini yaratdılar.

Müstəqilliyin elan edilməsi və yeni hökumətin təşkili xarici və daxili vəziyyəti yaxşılaşdırmadı. Hökumət daxili idarəetmədə aciz idi, vahid hakimiyyət yox idi. Ölkədə anarxiya başlamışdı. Zaqafqaziya seyminin nümayəndələri arasında fikir və məq-səd birliyi olmadığı kimi, müttəfiqlər Almaniya və Tükiyə arasında da məqsəd ayrılığı mövcud idi. Türkiyənin Qafqazda nüfuzunun art-ması ilə Almaniya razılaşmaq istəmirdi. Bu məqsədlə gürcülər-dən istifadə ön plana çəkilmişdi. Ermənilərdən də istifadə gündəm-də idi.

Belə bir şəraitdə gürcülər mayın 25-də Zaqafqaziyanın tərki-bin-dən çıxıb müstəqillik elan etdilər. Mayın 26-da Seymin sonuncu ic-lasında menşevik Sereteli Seymin buraxıldığını bildirdi. Mayın 27-də keçmiş Seymin müsəlman fraksiyasının iclası Milli Şuranın Rə-ya-sət heyətini seçdi. M. Ə. Rəsulzadə və F. X. Xoyski Milli Şuranın tərkibinə seçildilər. Mayın 28-də Tiflis şəhərində Azərbaycan Milli Şurası (24 nəfər lehinə, 2 nəfər bitərəf qalmaqla)Azərbaycanın müstəqilliyi haqqında Bə-yan-naməniimzaladılar.

İlk addım olaraq 1918-ci il iyun ayının 27- də Azərbaycan dili dövlət dili elan olundu. Bakıda ali əkinçilik məktəbinin yaradılması haqqında qərar qəbul edildi. Bakıda, Şəkidə, Gəncədə və Şuşada müəllimlər seminariyası açıldı. Salyanda, Qusarda, Zaqatalada müəllim hazırlayan kurslar təşkil edildi.

Avqustun 11-də Azərbaycanın müsəlman dinindən olan 1894 -1899-cu ildə anadan olmuş vətəndaşlar hərbi xidmətə çağrıldı. Əlbəttə, qısa müddətdə or-du yaratmaq çox çətin idi, ona görə də bu sahədə Türkiyə or-dusunun köməyindən istifadə olundu.

Azərbaycan imperiyanın Şərq öl-kələri ilə həmsərhəd idi və Azər-bay-canı onlarla maddi-mənəvi tellər bağlayırdı. Burada mərkəzdənqaçma meyilləri güclü oldu-ğun-dan çarizm onlara etibar etmir və yerli müsəlman əhali orduya ça-ğı-rılmırdı. Bu səbəbdən də, qonşu erməni və gürcülərdən fərqli olaraq Azərbaycanda zabit kadrları və əsgərlər çatışmırdı. Azərbaycan ərazisində əhəmiyyətli cəbhəxana da yox idi.

Cəbhəni tərk etmiş rus qoşunlarının yerini tutan erməni və qismən gürcü hərbi hissələri Osmanlı qoşunlarının təsiri altında geri çəkilərkən Azərbaycan əhalisindən qisas alırdılar. Milli müdafiə dəstələrinin yaradılmasının qarşısı alınırdı. Nəticədə, 1918-ci ilin mart soyqırımında azərbaycanlılar əliyalın qaldılar.

Məlumdur ki, 1917-ci ilin mayında toplanmış Qafqaz müsəlmanları qurultayı bir sıra qərarlarla yanaşı, müsəlman alayları yaratmaq haqqında da qərar qəbul etdi. Artıq noyabr ayında Za-qaf-qa-ziya Komissarlığı milli hərbi komissarlıq yaradılması haqqında qə-rar verdi. İlin sonunda artıq 3 korpus-piyada diviziyası, süvari bri-qa-dası və ərazi polkları var idi. Azərbaycan korpusunu təşkil et-mək general Ə. Şıxlinskiyə tapşırılmışdı.

Bildiyimiz kimi, ADR-in yaranmasından az sonra Bakı Soveti qoşunları Gəncə üzərinə hü-cuma hazırlaşırdı. Azərbaycan isə 600 nəfər-lik hərbi hissəyə malik idi. Yaranmış vəziy-yət-də kömək edəcək yeganə qüvvə Türkiyə idi. Bu səbəbdən də Seymin müsəlman fraksiyası Şərq Cəbhəsi ko- mandanı Vəhib paşadan kömək istə-di. Vəhib paşa dəfələrlə Zaqafqaziya qoşun-ları-na komandanlıq edən Odişelidze və general Pri-jevalskidən müsəlman əhaliyə qarşı cinayətlərə son qoyulmasını xahiş etsə də, nəticə olmamışdı.

May ayında Türkiyənin hərbi naziri Ənvər Paşa öz qardaşı Nuru Paşaya Gəncəyə hərəkət etmək barədə əmr verdi. Ayın sonun-da o, Azərbaycana təlimatçılar heyəti ilə birlikdə gəldi və hərbi quruculuq sahəsindəki işlər onu qane etmədi(4, səh.104-105). İyun ayında Azərbaycanda hərbi vəziyyət elan edil-di. Müsəlman korpusu «Əlahiddə Azərbaycan korpusu» adlan-dırıldı.(3, səh.137)

Qısa müddətli kurslar açıldı. Hərbi mükəlləfiyyət haqqında fər-man verildi. Bütün bunlara baxmayaraq, Xoyski Türkiyədən bir diviziya kömək istədi. Bağlanmış müqavilənin IV bəndinə əsasən Osmanlı dövləti yardım etməyi öhdəsinə götürdü. Köməyə göndə-ri-lən V Qafqaz diviziyası almanların müqaviməti üzündən Gəncəyə bir az gec gəldi. Diviziyanın komandiri Mürsəl Paşa idi. Sonra Kar-pat cəbhəsindən göürülmüş XV Çanaqqala diviziyası (komandiri - Nazim bəy) Gəncəyə yetişdi. Hərbi hissələr Qafqaz İslam Ordusu adı altında birləşdilər. Ordu Nuru Paşanın komandanlğı altında Göyçay ətrafında döyüşə girdi.**(4, səh.124)**

Göyçay döyüşündən sonra Bakı Soveti silahlı qüvvələri geri çəkilməyə başladılar. Kürdəmir cəbhəsinə göndərilən 1500 nəfərlik Biçeraxovun komandası altında olan polklar da cəbhəni saxlaya bilmədi. Şaumyanın xahişinə görə Ukrayna cəbhəsindən Petrovun komandası altında bir eskadron süvari, bir bölük dənizçi və topxa-na-dan ibarət qoşun, Həştərxandan 8 yelkənli gəmi ilə hərbi ləva-zi-mat göndərildi, lakin bu qüvvələr də Qafqaz İslam Ordusunun qarşısını ala bilmədi.

İyulun sonunda Şaumyan istefa verdi. Bakıdakı «Sentrokaspi diktaturası» Ənzəlidən Denstervilin başçılığı ilə 1500 nəfər əsgər və zabit dəvət etdi. Bu da Qafqaz İslam Ordusunun qarşısında dayana bilmə-di. Sentyabrın 15-də, Qurban bayramı günlərində Azərbaycan hissə-lə-ri Bakıya daxil oldu. Bakı uğrunda döyüşlərdə 1000-dən çox türk əs-gər və zabiti, 5 mindən artıq yerli əhali şəhid oldu. Lakin Türkiyə dünya müharibəsində məğlub olduğundan Mud--ros barışığına əsasən qoşunlar bir həftə ərzində Bakıdan, bir ay ər-zin-də isə Qafqazdan geri çəkilməli oldu. Müttəfiq qoşunları no-yabrın 17-də Bakıya daxil oldular.

Bakını «rus şəhəri» hesab edən Tomson, Biçeraxov və daşnak dəs-tələri işğal rejimi yaratdılar. Tomson özünü Bakının general-qu-ber--natoru elan etdi. Biçeraxov isə özünün «Qafqaz-Xəzər höku-mə-ti» ni yaratdı. Noyabrın 22-də Tomsonun tələbi ilə Azərbaycan kor-pu-sunun qərargahı Gəncəyə köçürüldü. S. Mehmandarov hərbi nazir, Ə.Şıxlinski müavin təyin edildi. İntendant mühəndis, növbətçi gene-ral, general-kvartir meyster, artilleriya, hərbi-təlim, topoqrafiya və nəzarət şöbələrin dən ibarət ordu yenidən təşkil olundu. 1919-cu il üçün nəzərdə tutulmuş dövlət büdcəsindən ordu üçün 3.994 milyon manat ayrıldı. Əlbəttə, bu azlıq təşkil edirdi.

Ümumiyyətlə, Azərbaycan Xalq Cümhuriyyəti dövründə hö-ku-mə-tin 5 kabineti fəaliyyət göstərdi. 26. 12. 1918 - 14. 03. 1919-cu il tarixədək fəaliyyət göstərmiş III, 14. 03. 1919 - 22. 12. 1919-cu il tarixədək fəaliyyət göstərmiş IV,24. 12. 1919 - 01. 04. 1920-ci tarixədək fəaliyyət göstərmiş V kabinədə hərbi nazir S.Mehmandarov (bitərəf) olmuşdur.

Oktyabrda Azərbaycan Milli Ordusu pol-kovnik Cavad Şıxlinskinin komandanlığı altın-da Zəngəzurda erməni milli hissələrinə qarşı hər-bi əməliyyata başladı. Ermənilərin Dığ kən-di rayonundakı istehkamları mühasirəyə alındı. İngilislərin işə qarışması ilə hücum dayandırıldı. Noyabrın 23-də erməni hissələri Zəngəzuru tərk etdilər.

Bundan bir qədər əvvəl, iyul ayında Azərbaycan Ordusu Muğan düzü və Lənkəran qəzasında da erməni qüv-vələrinə qarşı vuruşmuşdu. General Səlimovun başçılığı ilə 14 min nəfərlik iki alay polkovnik İlyaseviçin hərbi dəstələrini ləvğ et-mişdi. Muğan və Lənkəran Azərbaycana qaytarılmışdı. Qənimət kimi ələ keçirilmiş 24 top və plemyot milli orduya verilmişdi.

Azərbaycan Ordusunun qanunvericilik bazasında milli dəyərlər əsas yer tuturdu. S.Mehmandarov 1918-ci il 27 dekabr tarixli əmri ilə (34 №li) hərbi qulluqçular arasında salamlaşmanı, Hərbi Nazirliyin bərpasının ilk günlərindən hərbi qulluqçuların hərbi geyimlərini milliləşdirdi. Bu işə general Ə.Şıxlinski rəhbərlik edirdi. Azərbaycan dilində və azərbaycanlılar ararsında salamlaşma ənənəsinə uyğun olaraq aparlıması tələb edildi. Yəni salamlaşan şəxs «salam», qarşı tərəf isə «Əleyküm salam» deyə cavab verməli idi. Mehmandarov layihədə nəzərdə tutulan «Əleyküm salam»la razılaşmadı, daha yığcam olması üçün «mərhaba» deyilməli, əsgər cavabında «çox sağ ol» deməli idi.

Orduda ünsiyyət dili Azərbaycan dili qəbul edildi. Orduya qəbul edilən qeyri-azərbaycanlılardan tələb edilirdi ki, bir ay ərzində onlar komanda və əmrlərin Azərbaycan dilinə qarşılığını öyrənməli və şəxsi heyətə komandaları Azərbaycan dilində verməlidirlər.**(5, səh.95)**

Səməd bəy kadr siyasətində orduda müsəlman zabitlərin sayının artırılmasına çalışır, şübhəlilər ordudan uzaqlaşdırılırdı.

1919-cu iln sonlarından etibarən qoşun hissələri, əlahiddə taborlar və hərbi məktəb üçün döyüş bayraqlarının tətbiqinə başlandı. Bu bayraqlar milli dəyərlər əsasında hazırlanmışdı və onun verildiyi hissənin Azərbaycan ordusuna məxsusluğunu təsdiq edirdi. Bayraqlar eyni təsvirə malik idilər. Onun layihəsinin hazırlanması nazirliyin hərbi topoqrafiya şöbəsinə tapşırılmışdı və layihə hazırlanarkən milli simvolardan istifadəyə, milli ənənələrlə bağlı olan elementlərin tətbiqinə xüsusi diqqət yetirilmişdi.(5, səh.100-101)

Döyüş bayrağı parça, lent, ucluq, ağac və dəstəkdən ibarət idi. Bayrağın o biri üzü görünməsin deyə parça ikiqat bükülmüşdü.Yuxarı sol küncündə gümüşü saplarla səkkizgüşəli ulduz və aypara çəkilmişdi. Bayrağın kənarı ilə işlənmiş naxış Şərqin sərkərdəsi Teymurun Səmərqənd şəhərindəki qəbrinin üzərində olan təsvirdən götürülmüşdü və Azərbaycan Ordusunun döyüş bayrağında Şərqin qəhrəmanlıq ənənələrinin sadiqliyini təcəssüm etdirirdi. Bayrağın bir üzündə ərəb hərfləri ilə «Azərbaycan» sözü, o biri üzərində isə Qurandan ayə- «Nəsri min allah və fəthi qərb» (Allahdan kömək olarsa, qələbə yaxındadır) yazılmışdı. Bayrağın lentləri 15 santimetr enində yaşıl və qırmızı parçadan hazırlanmışdı və ucluqları 10 santimetr uzunluğunda saçaqlarla tamamlanmışdı. Qırmız lentin üzərində gümüşü saplarla içində 7 ox olan ox qabı, nizə və iki yay çəkilmişdi. Yaşıl lentin üzərində də gümüşü saplarla içində 7 ox olan oxqabı, iki yay, boncuq və Teymurləngin nizəsinin rəsmi işlənmişdi. Lentlər bayraq ağacının yuxarısına düyünlənirdi. Bayrağın ucluğu 5 hissədən ibarət idi: konus, silindr, kürə (şar), kəsik ellipsoid və nizə. Bayraq ağacı 2,6 metr uzunluğunda və 3,7 santimetr diametriedə olmalı idi. Dəstək gümüşü silindirdən ibarət olub bayraq ağacının qurtaracağına geydirilirdi. Dəstəyin aşağı və yuxarı qurtaracağı 2,5 millimetrlik qızıl haşiyə ilə əhatə edilmişdi. Daha sonra 1,5 millimetr enində qızıl haşiyə ilə tamamlanmış mavi mina var idi. Qızıl haşiyənin arasında yuxarı künclərdə Azərbaycan ulduzları nəqş olunmuş, aşağı künclərdə isə qızıldan aypara ziqzaq, daha sonra bayrağın rəngləri ilə boyadılmış, kürəciklərlə bəzədilmiş qabarıq gümüşü halqadan keçirdi. Dəstəyin gümüşü hissəsində bayrağın məxsus olduğu hissənin adı və həmin hissənin yaramnma tarixi həkk olunurdu. (5, səh.100-101)

***(Davamı gələn sayımızda)***



**Mais Əmrahov,**
**Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru**

# Elm məbədində

Xalqımız tarix boyu elmə, savada həmişə böyük maraq göstərmiş, təkamül yolunu oxumaqda görmüşdür. Hələ on ikinci əsrdə Şeyx Nizami yazırdı:

***Qüvvət elmdədir,***
***basqa cür heç kəs,***
***Heç kəsə üstünlük***
***eyləyə bilməz***

Bu gün elə bir azərbaycanlı ailəsi tapmazsan ki, övladının ali təhsil almasını, elm dalınca getməsini istəməsin. Və ya elə bir tədbirlərin nəticəsidir ki, filial fəaliyyəti dövründə bir sıra uğurlara imza atıb. Bununla yanaşı, sözügedən ali təhsil mərkəzi adlı-sanlı universitetlərlə sırf elmi, ictimai və mədəni əlaqələr saxlayır ki, bu da tələbələrin ikitərəfli münasibətlərinin inkişafına şərait yaradır. Onların dünyagörüşlərinə yeni töhfələr verir. Söhbət zamanı Əli müəllim bildirdi ki, filial pedaqoji kadrların ixtisasının artırılması və təkmilləşdirilməsi,



uşaq olmaz ki, özünü ali məktəb auditoriyasında görmək istəməsin.

Belə elm məbədlərindən biri də redaksiyamızın qonşuluğunda yerləşən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPİ) Quba filialıdır. Otaqlarımızın pəncərələri düz bu ali məktəbə baxır. Demək olar ki, hər gün tələbələrin dərsə gəlib-getmələrini seyr edirik.

Artıq bir-neçə gündür ki, ali məktəbdə imtahan həyəcanı yaşanır. İki bir, üç bir gələn tələbələr çox qayğılı görünürlər, xüsusən də birinci kursda oxuyanlar. Bu da əbəs deyil... Artıq imtahanlar başlayıb. İki gün əvvəl instituta gəldik. Auditoriyalarda tam bir sakitlik hökm sürürdü. Nəzarətçilərlə yanaşı, ADPU-nun Türk və Şərqi Avropa tarixinin tədris metodikası kafedrasının müdiri, dosent, tarix üzrə fəlsəfə doktoru Rəcəb Əliyev və əcnəbi tələbələrlə iş şöbəsinin müdiri, coğrafiya üzrə fəlsəfə doktoru Nurəddin Uluxanlı Bakıdan gələrək burada monitorinq keçirirdilər. Nəticələrin bidirilməsinin hələ tez olduğunu deyən müəllimlər ümumiyyətlə imtahanların gedişatından razı qaldıqlarını qeyd etdilər. Bildirdilər ki, bu yaxınlarda ölkə başçısı İlham Əliyevin fərmanı ilə AMİ-nin filalları ADPU-nun tabeçiliyinə verilmişdir. Bu baxımdan ADPU-nun müəllimləri rayonlara ezam olunublar. Doğrusu, burada yaradılan şərait, maddi-texniki bazanın möhkəmləndirilməsi istiqamətində görülən işlər heç də mərkəzdə fəaliyyət göstərən ali məktəblərdən geridə qalmır. Regionlarımızda fəaliyyət göstərən ali məktəblərdə də gənclərimizin ali təhsil almaları üçün əlverişli şərait yaradılıb. O cümlədən Quba filialı şimal regionunda da pedaqoji kadrların hazırlanmasında böyük rol oynayır.

Bəhs etdiyimiz elm ocağının direktoru, iqtisad elmləri doktoru, professor Əli Allahverdiyevin təlim-tədris və təhsil sahəsində həyata keçirdiyi uğurlu və şəffaf

bakalavr hazırlığına görə 16 illik iş təcrübəsinə yiyələnməklə hal-hazırda respublikamızda öndə gedən ali təhsil müəssisələrindən biridir. Filialda yarandığı gündən iki istiqamətdə-ixtisasartırma və bakalavr hazırlığı üzrə təhsil aparılır. Azərbaycan Müəllimlər İnstitutunun Quba filialı ümummilli lider Heydər Əliyevin 13 iyun 2000-ci il tarixli fərmanına əsasən Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) Quba filialının bazasında yaradılmışdır. Bu yaxınlarda isə institut ADPU-nun nəzdinə keçmişdir.

Birinci ili 15 nəfər tələbə kontingentindən ibarət olan filialda hazırda 700 nəfər tələbə təhsil



alır. 2015-2016-cı tədris ilində filialın əyani şöbəsinə 184 nəfər tələbə qəbul olunmuşdur.

Hal-hazırda sözü gedən təhsil müəssisəsində" İbtidai sinif müəllimliyi", "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi", "Tarix və coğrafiya müəllımlıyı" ,"Təhsildə sosial-psixoloji xidmət", "Riyaziyyat və informatika müəllimliyi", "Məktəbəqədər təlim və tərbiyə", "İbtidai sinif müəllimliyi" ixtisasları üzrə tələbələr təhsil alırlar. Filialda 7 nəfər elmlər doktoru, 23 nəfər isə müxtəlif elmlər üzrə fəlsəfə doktoru-dosent çalışır.

Son 2 ildə filialda əsaslı təmir işləri aparılmışdır. Tədris korpuslarının hər ikisində də auditoriyaların döşəmə və tavanları, qapı və pəncərələri dəyişdirilmiş, sanitar qovşaqları yenilənmiş, binaların istilik sistemləri, kommunikasiya xətləri təzələnmişdir. Akt zalı, yataqxana əsaslı təmir olunmuş, otaqlar müasir avadanlıqlarla təhciz edilmişdir. Auditoriyalar üçün elektron lövhələr alınmışdır.

Filialın kollektivi var gücü ilə qazandığı uğurları hər zaman yeniləməyə, qoruyub saxlamağa çalışır.

**Məzahir Həmidoğlu,**
***"Şəfəq" qəzeti, 15 yanvar 2016-cı il***

## Yanğının qarşısını almaq onu söndürməkdən asandır

Ulu öndərimiz Heydər Əliyev demişdir “Bir hadisənin qarşısını almaq, onun nəticələrini aradan qaldırmaqdan daha asandır”.

Əməyin mühafizəsi və təhlükəsizlik texnikası üzrə qanunvericilik aktları bütün müəssisələrdə işçilərə, fəhlə və qulluqçulara sağlam,təhlükəsiz əmək şəraitinin yaradılması dövlət proqramlarından biridir və dövlət tərəfindən müvafiq qanunvericilik aktları ilə tənzimlənir.

İşçilərin təhlükəsiz əmək şəraitini yaratmaq üçün bütün iş yerləri təhlükəsizlik texnikası tələblərinə cavab verməlidir.İş yerləri sanitariya-gigiyena normalarına uyğun qurulmalı, insan həyatının təhlükəli mühit və amillərdən qorunması üçün tədbirlər görülməlidir.

İnsanların həyat və sağlamlıqlarının yanğından qorunması və yanğın təhlükəsizliyi qaydalarına əməl olunması vacib məsələlərdən biridir.

Yanğınlar əsasən odla ehtiyatsızlıqdan, söndürülmədən atılmış siqaret kötüyündən, daxili yanacaq mühərriklərinin atqı borularından çıxan qığılcımlardan törənir.Yanğınların vurdugu ziyanın qarşısının alınması üçün yanğına qarşı təbliğat işinin aparılması vacib şərtlərdəndir.Yanğına qarşı təbliğat işləri genişləndirilməli və əhali arasında yanğın təhlükəsizliyi ilə bağlı məsuliyyət hissi artırılmalıdır. Bu sahədə ardıcıl və mütəmadi işlər aparılarsa, müsbət nəticələr əldə etmək olar.Təbliğatın əsas məqsədi yanğına qarşı təhlükəsizlik qaydalarını insanların şüuruna aydın çatdırmaqdır. Fövqəlada Hallar Nazirliyinin Dövlət Yanğın Nəzarəti Xidməti tərəfindən göndərilmiş plan və göstərişlər vaxtında yerinə yetirilərsə, o zaman görülən işlər müsbət nəticə verəcəkdir.

Təbliğat işi düzgün, mütəşəkkil və səmərəli şəkildə aparılarsa, baş verə biləcək yanğın hadisələrinin, dəyəcək maddi ziyanların və insan tələfatının qarşısını almaq olar.Onu da bilməliyik ki, təbliğat profilaktika işinin vacib və zəruri olan tərkib hissəsidir.

Baş vermiş yanğınların geniş miqyasda yayılmasının əsas səbəbi sahələrdə ilkin yanğınsöndürmə vəsaitinin və yanğının söndürülməsi ücün su ehtiyatının olmaması, eləcə də yanğınların söndürülməsi zamanı işçi heyətinin öz vəzifə borclarını bilməməsidir.

Yanğınların baş verməsinin əsas səbəblərindən biri elektrik naqillərində yaranan hər hansı bir nasazlıqdır. Elektrik yanğınları əsasən elektrik xətlərinin həddindən artıq qızmasından və elektrik cihazlarının həddindən artıq yüklənməsindən baş verir. Qızma nəticəsində elektrik xətlərinin izolyasiya örtüyü əriyə və ya yana bilər. Bu da iş yerində təhlükə mənbəyinə çevrilə bilər.Digər tərəfdən həddindən artıq yüklənmiş elektrik cihazlarının motorları qızaraq ətrafda olan tezalışan maye və cisimləri yandıraraq yanğınla nəticələnə bilər.

İş yerində təhlükəsizlik qaydalarına riayət edin

Elektrik enerjisində yaranan hər hansı təhlükənin aradan qaldırılması ilə əlaqədar rəhbərliyə məlumat verin və bu təhlükənin qısa müddətdə aradan qaldırılması üçün çalışın.

İş yerinin təmiz saxlanması,naqillərin yoxlanması və s. kimi təmizlik işləri vaxtınızı alsa da,bu cür profilaktik tədbirlər elektrik qəzalarının qarşısını ala bilər.Elektrik avadanlıqlarını işlətməzdən əvvəl, həmin cihazın istifadə qaydalarını öyrənin.

Baş verə biləcək bədbəxt hadisələrin qarşısını almaq üçün:

- elektrik cihazları ilə davranarkən xüsusi qaydalara riayət edin;
- elektrik avadanlıqlarından ,cihazlarından düzgün istifadə edin və onları təmiz saxlayın;
- qızdırıcı naqili istifadə etməzdən əvvəl onu yoxlamaq lazımdır.Zəif qığılcım,qeyri - standart istilik və elektrik cihazlarından istifadə etməyin.Əgər belə bir şübhəli hal yaranarsa,dərhal bu barədə məlumat verin;
- kağız qırıntılarını yerdən süpürün,tezalışan əşyaları qızdırıcılardan və başqa elekrtik cihazlarından uzaqda saxlayın.Otaqdan çıxarkən qızdırıcı və plitələri söndürməyi unutmayın;
- təhlükəyə qarşı hazırlıqlı olun;
- yanğın zamanı nə edəcəyinizi planlaşdırın ki, hadisə zamanı tez hərəkət edə biləsiniz. Ən yaxında olan yanğınsöndürəndən, ondan istifadə qaydasından,ən yaxın yanğın çıxışından və yanğın zamanı evakuasiya planından xəbərdar olun;

.- iş yerində elektrik xətlərinin və cihazların həddindən artıq qızmasına imkan verməyin və hər zaman yanğınla mübarizəyə hazırlıqlı olun;

-elektrik cihazlarını təmizləyərkən onları elektrik xəttindən çıxardın.Heç vaxt metal əşyaları elektrik cihazlarının və yuvaların içinə salmayın,sizi cərəyan vura bilər. Həddindən artıq qızan elektrik cihazlarını dərhal elektrik xəttindən çıxardın və onları mütəxəssisə göstərin;

- elektrik cihazlarının naqilləri ilə ehtiyatlı davranın ,elektrik cihazlarını cərəyandan ayırarkən naqildən yox,ştepselden tutun;
- elektrik cihazlarını naqildən tutaraq daşımayın;
- naqilləri xalçanın və ya mebelin altında saxlamayın;
- naqili zədələnmiş və ya izolyasiya olunmuş elektrik cihazlarından istifadə etməyin;

Yadda saxlayın

Elektrik xətlərində yanğın baş verdikdə, su ilə söndürmək qəti qadağandır.Gərginlik naqilləri açılmalı və bundan sonra yanğın su ilə söndürülür. Gərginlik naqillərini açmaq mümkün deyilsə, yanğın “karbonlu” yanğınsöndürmə balonlarından istifadə etməklə söndürülür.

Digər mənşəli yanğınlar su,qum və köpüklü yanğınsöndürmə balonlarından istifadə etməklə söndürülür.Yanğından zərərçəkmiş şəxslərə ilkin tibbi yardım göstərməli və yaxınlıqdakı tibb məntəqəsinə çatdırılmalıdır.Yanğın zamanı pəncərələrin və qapıların açılması, həmçinin şüşələrin sındırılması qəti qadağandır, çünki hava axını yanğının yayılmasına səbəb olur.

**Validə Ağamalıyeva,**
**Əməyin mühafizəsi və təhlükəsizlik texnikası üzrə mühəndis, qabaqcıl təhsil işçisi, Prezident mükafatçısı**

## Kitabxanamız zənginləşir

1. Nizami Xudiyev. “Azərbaycan ədəbi dili tarixindən seminar məşğələləri.” (Ali məktəblər üçün dərs vəsaiti). II nəşr. Bakı,“Elm və təhsil”, 2015, 150 s.

Vəsaitdə Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən təsdiq olunmuş proqrama müvafiq olaraq ədəbi dil tarixinə dair materiallar və ondan istifadəyə dair konkret göstərişlər verilmişdir. Materiallarda tarixilik gözlənilmiş, müasir dilimiz üçün arxaikləşən leksik-qrammatik xüsusiyyətlər və nümunələrin götürüldüyü mənbələrin əsli saxlanmışdır.

2. Nizami Xudiyev. (Xudiyev Nizami Mənaf oğlu) “Cənubi Azərbaycanda ədəbi dilimizin dünəni və bu günü”. Bakı, “Elm və təhsil” , 2012, 224 s.

Kitab az öyrənilmiş, tədqiqinə ciddi ehtiyac olan mühüm bir məsələyə- Cənubi Azərbaycanda ədəbi dilimizin inkişaf problemlərinə həsr edilmişdir.

3. Nizami Xudiyev. “Qədim türk yazılı abidələrinin dili”. Bakı, “Elm və təhsil”, 2015, 596 s.

Kitabda qədim türk yazılı abidələrinin tədqiqi məsələləri, fonetikası, leksikası və qrammatikası (morfologiyası və sintaktik quruluşu) araşdırılır.

4. Əzizxan Tanrıverdi. “Dədə Qorqud”un möcüzələr dünyası”. “Dədə Qorqud” eposunun elm aləminə bəlli olmasının 200 illiyinə həsr olunur. Bakı, “Elm və təhsil”, 2015, 536 s.

Monoqrafiyada “Dədə Qorqud” kitabının dilindəki qohumluq terminləri, zaman anlayışını ifadə edən vahidlər, silah və döyüş geyimlərinin adları tarixi-linqvistik müstəvidə araşdırılır, eyni zamanda bu tip vahidlərin poetiklik yaratma imkanlarına mətn kontekstində işıq salınır.

5. Əzizxan Tanrıverdi. “Çal qılıncını, xan Qazan!”. (“Dədə Qorqud kitabı”nda silah adları). Bakı, “Elm və təhsil”, 2015, 192 s.

“Çal qılıncını, xan Qazan!” filologiya üzrə elmlər doktoru, professor Ə. Tanrıverdinin “Dədə Qorqud” dastanının dilinə həsr etdiyi on birinci kitabdır. Monoqrafiyada silah, silah hissələri və döyüş geyimlərinin adları tarixi- linqvistik müstəvidə araşdırılır.

6. Buludxan Xəlilov. “İsmayıl Şıxlının ədəbi-tənqidi görüşləri”. Bakı, “Bakı Çap Evi” nəşriyyatı, 2014, 120 s.

Kitabda İsmayıl Şıxlının ədəbi tənqidlə bağlı fikirləri, ədəbi prosesdə tənqidçinin oynadığı rol və digər məsələlər tədqiq olunur.

7. Buludxan Xəlilov. “İsmayıl Şıxlı: müəllim haqqında müəllim sözü”. Bakı, “Bakı Çap Evi” nəşriyyatı, 2014, 108 s.

Kitabda İsmayıl Şıxlının həyat və yaradıcılıq yolundan bəhs olunur.

8. Buludxan Xəlilov. “Bəxtiyar Vahabzadənin pedaqoji görüsləri”. Bakı, “Bakı Çap Evi” nəşriyyatı, 2014, 128 s.

9. Buludxan Xəlilov. “Bəxtiyar Vahabzadənin dilçilik görüşləri”. Bakı, “Bakı Çap Evi” nəşriyyatı, 2014, 244 s.

Kitabda B.Vahabzadənin XX əsrin 50-80-ci illərində dilə və dilçilik məsələlərinə təəssübkeşliklə, mütəxəssis kimi yanaşması, dil və dilçiliklə bağlı olan ən vacib məqamları nəzərə çatdırması özünə geniş yer alır.

10. Buludxan Xəlilov. “İsmayıl Şıxlının dilçilik görüşləri”. Bakı, “Bakı Çap Evi” nəşriyyatı, 2014, 170 s.

Kitabda İ.Şıxlının XX əsrin 50-80-ci illərində dil və üslub məsələlərinə münasibəti, hər ifadənin, sözün düzgün və yerli- yerində işlənməsinə çağırışı təhlil olunur.

11. Məhərrəmov A.M.,Bayramov M.R.,Hüseynova B.Ə., Qasımova Ş.Z., Həsənova G.M. “Neftin heteroatomlu birləşmələri”. Ali məktəblər üçün dərs vəsaiti. Bakı, “Bakı Universiteti” nəşriyyatı, 2015, 248 s.

Dərs vəsaitində neftin ayrı- ayrı heteroatomlu birləşmələrinin (oksigenli, kükürdlü, azotlu, eləcə də neftin yüksək molekullu maddələri ) neft və neft fraksiyalarında paylanması, xassələri, quruluşları, neft və neft məhsullarından ayrılma üsulları, mənşəyi, tətbiq sahələri, Azərbaycan neftinin tədqiqindən alınan nəticələr şərh olunur.

12. Mehdiyeva A.Ə. “Orta əsrlər tarixi”. Dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2015, 522 s.

13. Fikrət Rzayev “Söz. Söz konstruktorluğu. Sözün sirri”. II nəşr. Bakı, 2015, 559 s.

14. Bayramov H.B. “Çar Rusiyasının Azərbaycandakı təhsil siyasəti: unifikasiya prosesi və tarixi-pedaqoji paradiqmanın formalaşması”. Monoqrafiya. Bakı, “Elm”, 2015, 368 s.

Monoqrafiyada ictimai-humanitar elmlərin müasir inkişafı zəminində tarixi keçmişimizin obyektiv təhlili və öyrənilməsi zərurətinə əsaslanmaqla, Çar Rusiyası dövründə Azərbaycana yönəlik təhsil siyasətinin mahiyyəti, məqsədi, vəzifələri, metodları, dünyəvi təhsilin təşəkkülü prosesinə müvafiq aparılan tədris- təşkilati işlərin sistemi və s. məsələlər imperiyanın geopolitik manevrləri kontekstində özünün əhatəli tədqiqini tapmış, ziyalılarımızın milli maarifçiliyin tarixi təşəkkülündəki müstəsna xidmətləri öyrənilmişdir.

15. Hidayət (Orucov Hidayət Xuduş oğlu): biblioqrafiya. Azərbaycan Milli Kitabxanası. Əlavələrlə II nəşri. Bakı, 2014, 368 s.

Azərbaycan Milli Kitabxanasının “Azərbaycanın görkəmli şəxsiyyətləri” seriyasından hazırladığı növbəti biblioqrafiyada müasir Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, ictimai-siyasi xadim Hidayətin əsərləri, həyat və yaradıcılığı, siyasi fəaliyyəti haqqında zəngin məlumat toplanmışdır.

16.Ramiz Heydər. “Tanrıya gedən yol” (poema). Bakı, “ Vektor” Nəşrlər Evi, 2008, 150 s.

R. Heydərin “Tanrıya gedən yol” kitab-poeması Azərbaycan ədəbiyyatının və elminin dünya təmsilçilərindən biri, tanınmış şair-alim, professor-doktor Elçin İsgəndərzadənin vətənpərvər-vətəndaş ömründən bəhs edir.

17.“Professor Əli Məhərrəm oğlu Hüseynov. Bioqrafiyası, elmi-pedaqoji fəaliyyəti”. Bakı, 2015.

Professor Əli Hüseynovun 80 illik ömür salnaməsinə bir baxış.

Kitab, görkəmli bioloq alim, pedaqoq, professor, p.e.d. Əli Hüseynovun həyatı, elmi və pedaqoji fəaliyyətini qısa əks etdirir.

18. Qarayev M.A. “Uşağın anatomiya və fiziologiyası”. Dərslik. Bakı, 2015, 400 s.

Kitabda uşaq və yeniyetmələrin anatomiya, fiziologiya və gigiyenası fənninin predmeti, məqsədi, insanın fərdi inkişafının əsas mərhələləri və orqanizmin müxtəlif sistemlərinin ortogenezi ətraflı şərh olunmuşdur.

19.Əhmədov Q.T.,Həsənov K.Q., Yaqubov M.H. “Adi diferensial tənliklər”. Ali məktəblər üçün dərslik. Bakı, “Bakı Universiteti” nəşriyyatı, 2015, 592 s.

Dərslik universitetlərin riyaziyyat fakültələrində tədris olunan “Adi diferensial tənliklər” kursunun proqramını tamamilə əhatə edir və əlavə olaraq yeni mövzular da verilib ki, bu mövzular müasir riyaziyyatın tətbiqi məsələlərinin öyrənilməsinə kömək edər.

20. Nizami Məmmədov-Tağısoy. “ Qaraqalpaq ədəbiyyatı”. Bakı, “ Elm və təhsil”, 2015, 456 s.

Kitabdan ali məktəblərin bakalavriat və magistratura pilləsində təhsil alan tələbələr, dissertantlar və doktorantlar, türk xalqları tarixi, etnogenezi, folkloru, mədəniyyəti və incəsənəti, klassik ədəbiyyatı, XX əsr ədəbiyyatı ilə maraqlananlar və digərləri istifadə edə bilərlər.

21.Əlizadə Əsgərli. “Xəlil Rza Ulutürk”. (Həyatı, fəaliyyəti, sənəti). Bakı, “Elm və təhsil”, 2015, 620 s.

Kitab müəllifin uzun illər “XX əsr Azərbaycan ədəbi-nəzəri fikrində milli ideal və xalq taleyi problemi Xəlil Rza Ulutürkün yaradıcılığı əsasında” apardığı tədqiqatların əsasında hazırlanmışdır. Monoqrafiyada milli özünüdərk, milli şüur, milli mənlik şüuru, milli ideal və xalq taleyi kimi məsələlərin izahı özünə yer almışdır.

22.Mübariz Əmirov. “Ümumtəhsil məktəblərində tarixin fəal/interaktiv təlimi metodikası”. (Ali məktəblərin tarix fakültəsi tələbələri üçün dərs vəsaiti). Bakı, 2014, 678 s.

Dərs vəsaitində verilən materiallar tarixin təlimi metodikasının ən aktual məsələlərinə aydınlıq gətirir.

23.Əlif Məmmədov. “Elementar riyaziyyata aid məsələ və misallar” (həlli ilə ). Metodik və sait. Bakı, ADPU- nun mətbəəsi, 2015, 979 s.

Vəsaitdə cəbri və triqonometrik tənliklər, tənlik qurmaqla həll olunan cəbri məsələlər, tənliklər sistemi, dəyişəni olan bərabərsizliklər sistemi birinci və ikinci fəsildə həlli ilə verilir.

24. Nadir Abdullayev. “Nitq mədəniyyətinin əsasları”. Dərs vəsaiti. Bakı, “MBM”, 2015, 280 s.

Vəsaitdə nitq mədəniyyətinin əsasları, problemin tədqiqi tarixi və nitq mədəniyyətinə yiyələnməyin əhəmiyyətindən danışılır, mədəni nitqə verilən tələblər, şərtlər, nitqin ifadəliliyini təmin edən vasitələr və s. yığcam şəkildə şərh olunur.

25.Eldəniz Məmmədov. “Səlcuqlar”. Dərs vəsaiti. Bakı, “Mütərcim”, 2015, 204 s.

Dərs vəsaitində türk xalqlarının tarixində mühüm mərhələni təşkil edən Böyük Səlcuq dövlətinin yaranması, onun Mərkəzi Asiya və İrana məğlubedilməz yürüşləri, Malazgird döyüşü, Anadolu Səlcuq dövlətinin yaranması, səlib yürüşlərinə qarşı aparılan mübarizə, Miryakəfalon döyüşünün hərbi və siyasi əhəmiyyəti açıqlanmış, Səlcuq dövlətinin Əlaəddin Keyqubadın hakimliyi və nəhayət, Anadolunun monqolların istilası dövrünün tarixinin ümumiləşdirilməsinə cəhd edilmişdir.

26.Vahid Rzayev. “Var olandan, Var olmuşuq”. Bakı, 2015, 220 s.

27.“Şirvanşahlar sarayı: tarix, həqiqətlər, mülahizələr”. (elmi-praktik konfrans). Məqalələr toplusu, Bakı, “Elm və təhsil”, 2015, 375 s.

28.Maqerramov A.M., Bayramov M.R. «Ximiə alkenilfenolov». Monoqrafiə. Baku, İzdatelğstvo «Bakı Universiteti», 2015, 400 s.

**Fəridə Məmmədova,**
**Elmi kitabxananın Məlumat-biblioqrafiya şöbəsinin böyük biblioqrafı**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və informatika fakültəsinin dekanı, professor Maqsud Nəcəfova bacısı

**Zemfira xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlova bacısı

**Ruqiyyə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Kurikulum, qeydiyyat və tyutor xidmətinə nəzarət bölməsinin müdiri, dosent Nazim Abbasova anası

**Narınc xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekan müavini, dosent Mirvari Verdiyevaya atası

**İdris Verdiyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Rasim Abdurazaqova atası

**Hacı Rəşidin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Müseyib İlyasova bacısı

**Almaz xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Korreksiyaedici təlim kafedrasının müdiri Nailə Hüseynovaya anası

**Fəridə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının dosenti Qulaməli Balaşova bacısı

**Kübra xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının baş müəllimi Gülnarə Xaspoladovaya atası

**Yaşar Quliyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 439
Sayı: 1500
Çapa imzalanıb: 29.01.2016-cı il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.